BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

# GƏNC MÜƏLLİM

QƏZET 1958-ci İLDƏN NƏŞR OLUNUR

İyun 2018 № 6 (1093)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## Mehdi Hüseynzadənin 100 illik yubileyinin keçirilməsi haqqında
### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

2018-ci ilin dekabr ayında Azərbaycan xalqının qəhrəman oğlu, İkinci Dünya müharibəsi dövründə antifaşist müqavimət hərəkatının görkəmli nümayəndəsi, Sovet İttifaqı Qəhrəmanı Mehdi Hənifə oğlu Hüseynzadənin anadan olmasının 100 illiyi tamam olur.

Mehdi Hüseynzadə 1941-1945-ci illər müharibəsində faşizmə qarşı mübarizədə apardığı çoxsaylı uğurlu kəşfiyyat əməliyyatları və nümayiş etdirdiyi misilsiz hərbi şücaətləri ilə böyük şöhrət qazanmış və Azərbaycan xalqının zəngin tarixi hünər salnaməsinə şanlı səhifələr yazmışdır. Yüksək əxlaqi keyfiyyətlərə malik cəsur kəşfiyyatçının rəşadət dolu şərəfli həyat yolu bu gün Vətənimizin sərhədlərini layiqincə qoruyan və işğal altındakı torpaqlarımızı azad etməyə hər an hazır olan mətin Azərbaycan əsgəri üçün parlaq qəhrəmanlıq nümunəsidir.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq və gənc nəslin Vətənə məhəbbət ruhunda tərbiyəsində xüsusi əhəmiyyətini nəzərə alaraq, Azərbaycan xalqının igid övladı Mehdi Hüseynzadənin anadan olmasının 100-cü ildönümünün qeyd olunmasını təmin etmək məqsədi ilə *qərara alıram:*

1.Azərbaycan Respublikasının Müdafiə Nazirliyi Azərbaycan Respublikasının Təhsil Nazirliyi və Azərbaycan Respublikasının Mədəniyyət Nazirliyi ilə birlikdə Sovet İttifaqı Qəhrəmanı Mehdi Hüseynzadənin 100 illik yubileyinə dair tədbirlər planını hazırlayıb həyata keçirsin.

2.Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham Əliyev,**
**Azərbaycan Respublikasının Prezidenti**
Bakı şəhəri, 23 iyun 2018-ci il.

## ADPU-nun Şamaxı Filialında "Müəllim, məni yaradıcılığa ruhlandır!" mövzusunda pedaqoji oxular keçirildi

**Artıq dördüncü ildir ki, humanist pedaqogika ideyaları Azərbaycan müəlliminə sistemli olaraq tanıdılır. Bu istiqamətdə ilk addım 2014-cü ilin dekabrında atıldı. Azərbaycan Respublikası Təhsil İnstitutunun təşkilatçılığı ilə Bakıda professor Şalva Amonaşvilinin "Təhsil sistemində uşaqlara humanist şəxsiyyət kimi yanaşma" mövzusunda dördgünlük müəllif seminarı təşkil olundu.**

2014-cü ildən sonra ikinci dəfə- 21-25 dekabr 2016-cı il tarixlərində ADPU-nun, ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin (ADPK) və Respublika Humanist Pedaqogika Mərkəzinin (RHPM) birgə təşkilatçılığı ilə universitetdə Humanist pedaqogika üzrə "Təhsildə mənəvi-əxlaqi dəyərlər: harmonik şəxsiyyətin inkişafı" mövzusunda II beynəlxalq seminar keçirildi. Üçüncü dəfə isə 22-25 mart 2018-ci il tarixlərdə Bakı şəhərində Təhsil Nazirliyi, Beynəlxalq Humanist Pedaqogika Mərkəzi və ADPU-nun təşkil etdiyi Humanist Pedaqogika üzrə XVII Beynəlxalq Oxularda Rusiya, Ukrayna, Belarus, Qazaxıstan, Latviya, Litva, Estoniya və Gürcüstandan 300-dən çox təhsil işçisi iştirak etdi. Bu beynəlxalq tədbir təhsil ictimaiyyəti tərəfindən böyük rəğbət və maraqla qarşılandı.

ADPU-nun təşkilatçılığı ilə Şamaxı Filialında 2 iyun 2018-ci il tarixdə "Müəllim, məni yaradıcılığa ruhlandır!" mövzusunda növbəti pedaqoji oxular keçirildi. Oxuların məzmununda təhsilalanlarda mənəvi-əxlaqi dəyərlərin inkişaf etdirilməsi və müasir tendensiyalar, humanist pedaqogika üzrə mövcud qabaqcıl təcrübənin mübadiləsi və təhsilə inteqrasiyası məsələləri yer aldı. Oxularda ADPU-nun rəhbərliyi və professor-müəllim heyəti, Humanist Pedaqogika Mərkəzinin nümayəndələri, filialın professor-müəllim heyəti və tələbələri, həmçinin Şamaxı, Ağsu, Bərdə, Göyçay, Hacıqabul, İsmayıllı, Kürdəmir, Oğuz, Qəbələ, Qobustan, Sabirabad və Ucar rayonlarının qabaqcıl təhsil işçiləri iştirak edirdilər. Bu tədbir imkan verir ki, daha çox pedaqoq tədbirdən faydalansın, adları göstərilən RTŞ-lərin rəhbər nümayəndələri, metodik kabinetlərin müdir□ləri, qabaqcıl müəllimlər, məktəb rəhbərləri və digər təhsil işçiləri arasında humanist pedaqogika ideyalarının daha geniş yayılması reallaşdırılsın.

Tədbirdən öncə Şamaxı Rayon İcra Hakimiyyətinin başçısı Asif Ağayev və ADPU-



nun rektoru, professor Cəfər Cəfərov başda olmaqla bir qrup qabaqcıl elm adamları Şamaxı şəhərindəki ulu öndər Heydər Əliyevin abidəsini ziyarət etdilər, abidənin önünə gül dəstələri düzdülər.

Tədbir ADPU-nun Şamaxı Filialının akt zalında davam etdirildi.

Plenar iclas Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlandı. Sonra filialın direktoru, dosent Tünzalə Yusifova filialın kollektivi adından tədbir iştirakçılarını salamladı. T.Yusifova bir il öncə - 2017-ci ilin may ayında "III Beynəlxalq Həmzə Nigari Türk Dünyası Mədəni İrsi Simpoziumu"nun və bu il "Müəllim, məni yaradıcılığa ruhlandır!" mövzusunda pedaqoji oxuların Şamaxı Filialında keçirilməsinə yaxından dəstək, diqqət və qayğı göstərdiklərinə görə Şamaxı Rayon İcra Hakimiyyətinin başçısına və ADPU-nun rektoruna minnətdarlıq etdi.



Rektor Cəfər Cəfərov tədbir iştirakçılarını salamlayaraq humanist pedaqogika üzrə oxuların mahiyyəti haqqında geniş məruzə ilə çıxış etdi.

Sonra Şamaxı Rayon İcra Hakimiyyəti başçısının müavini Gülnisə Ələkbərova Şamaxı Rayon İcra Hakimiyyətinin başçısı adından gələn qonaqları salamladı və belə bir tədbirin qədim mədəniyyət beşiyi olan Şamaxı şəhərində keçirilməsini təqdirəlayiq hal kimi qiymətləndirdi.

Tədbirin plenar iclasında ADPU-nun nəzdində ADPK-nin direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov "Müasir pedaqogikanın daşıyıcıları", ADPU-nun İbtidai təhsil fakültəsinin dekanı pedaqogika üzrə elmlər doktoru, professor, Əməkdar elm xadimi Fərrux Rüstəmov "Yaradıcı ürəklərin simfoniyası", Azərbaycan Respublikası Təhsil İnstitutunun Psixologiya və yaş fiziologiyası şöbəsinin müdiri, psixologiya üzrə elmlər doktoru Elxan Bəylərov "Müəllim, uşaqla yüksəl!", ADPU-nun Filologiya fakültəsinin dekanı, filologiya üzrə elmlər doktoru, professor Buludxan Xəlilov "Humanist tərbiyə mədəniyyəti" mövzularında təqdimatlarla çıxış etdilər.

ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, fizika-riyaziyyat elmləri doktoru, professor Asəf Zamanov informasiya cəmiyyəti dövründə gənc nəslin müasir tələblərə uyğun formalaşdırılması üçün cəmiyyətin, xüsusilə müəllimin və məktəbin əsas vəzifələri barədə çıxış etdi.

Sonra ustad dərsləri keçirildi. Azərbaycan Respublikasının Əməkdar müəllimi Asif Cahangirovun "Yaradıcı direktor-yaradıcı mühit" və Bakı Humanitar Kollecinin direktor müavini Afaq Əliyevanın "Öyrənən və öyrədənlər - kimdir onlar?" mövzusunda ustad dərsləri təhsil işçilərinin marağına səbəb oldu.

Ustad dərslərdən sonra müzakirələr - pedaqoji oxuların iştirakçıları ilə panel görüşü, sualların cavablandırılması keçirildi. Tədbir iştirakçıları pedaqoji oxuların çox böyük əhəmiyyət kəsb etdiyini vurğuladılar. Tədbirdə iştirak edən 200-ə qədər təhsil işçisinə sertifikatlar təqdim olundu.

## Yaz semestrinin imtahan sessiyası

Azərbaycan Respublikasının Təhsil naziri Ceyhun Bayramovun "İmtahan sessiyasının təşkili və keçirilməsi barədə" imzaladığı 14 may 2018-ci il tarixli 354 nömrəli əmrdə ali və orta ixtisas təhsili müəssisələrində 2017-2018-ci tədris ilinin yaz semestrinin imtahan sessiyasının mövcud qaydalara uyğun təşkil edilməsi, tələbələrin biliyinin qiymətləndirilməsində şəffaflığın və obyektivliyin təmin olunması, imtahan sessiyasının mövcud normativ sənədlər əsasında keçirilməsi, təhsil müəssisələrində imtahan qərargahlarının yaradılması, bu qərargahlara daxil olan hər bir şikayətin qısa müddətdə çevik şəkildə araşdırılıb lazımi tədbir görülməsi, eyni zamanda imtahanlarda şəffaflığın təmin edilməsi üçün ictimaiyyətin və tələbələrin valideynlərinin iştirakına şərait yaradılması öz əksini tapıb. Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) bu əmrin icrası ilə bağlı müvafiq əmr imzalanıb. Yaz semestrinin imtahan sessiyasında yazılı və VTS-TEST sistemi üzrə tələbələrin imtahan nəticələrinin qiymətləndirilməsində olan şikayətlərin araşdırılması və düzgün qiymətləndirməsini təmin etmək məqsədilə 8 nəfərdən ibarət Apelyasiya Komissiyası yaradılıb. Apelyasiya Komissiyasının sədri dosent Nailə Hüseynovadır. Eyni zamanda yaz semestrinin imtahan sessiyasının obyektivliyini və şəffaflığını təmin etmək məqsədilə 7 nəfərdən ibarət İmtahan Qərargahı yaradılıb. İmtahan Qərargahının sədri dosent Zahir Kazımovdur. Həmçinin fakültə dekanlarının, kafedra müdirlərinin və digər struktur bölmələrin həyata keçirəcəkləri vəzifələr müəyyən edilib. Sessiyanı normal mənəvi-psixoloji şəraitdə, obyektiv başa çatdırmaq üçün bütün hazırlıq işləri və təşkilati məsələlər vaxtında yekunlaşdırılıb, imtahanların keçirilməsi üçün lazımi sənədlər tələblərə uyğun hazırlanıb. İmtahan işinin təşkili üzrə İşçi Qrupu yaradılıb. Apelyasiya Komissiyası ADPU-nun Üzeyir Hacıbəyli küçəsi, 68 ünvanındakı I nömrəli tədris binasının II mərtəbəsində, 240 nömrəli otaqda fəaliyyət göstərib. İmtahan Qərargahı və qaynar xətt **(qaynarxett@adpu.edu.az <mailto:qaynarxett@adpu.edu.az>.)** də universitetin Üzeyir Hacıbəyli küçəsi, 68 ünvanındakı I nömrəli tədris binasının II mərtəbəsində, 205 nömrəli otaqda fəaliyyət göstərib. Bunlarla yanaşı, imtahanlara buraxılma, imtahanların təşkili, keçirilməsi qaydaları, imtahan koordinatorlarının vəzifələri, hüquqları və tələbələrin imtahanın gedişində hansı hərəkətlərə yol verməmələri barədə elanlar vurulub. Apelyasiya Komissiyasının və İmtahan Qərargahının əlaqə telefonları bütün tələbələrə elan edilib və universitetin saytında yerləşdirilib.

**(Davamı 2-ci səhifədə)**

# Yaz semestrinin imtahan sessiyası

(Əvvəli 1-ci səhifədə)

İmtahan Qərargahına daxil olan hər bir şikayətin qısa müddətdə çevik araşdırılıb təmin edilməsi, imtahanların təşkilində və gedişində mənfi hallara yol vermiş şəxslər barədə universitetin rəhbərliyinə mütəmadi məlumat verilməsi tapşırılıb. İmtahan sessiyasının çevikliyini təmin etmək məqsədilə fakültələr üzrə koordinator rəhbərləri və koordinatorlar təyin edilib. Koordinator rəhbərləri və koordinatorlar qeyri-ixtisas sahibləridir. İmtahanlar hər gün saat 9:00-da başlayıb, 17:30-da bitib. Yazılı imtahanlar gün ərzində 3 dəfə- saat 9:00, 12:00, 15:00-da keçirilib. Test üsulu ilə hər 45 dəqiqədən bir imtahanlar keçirilib. Gün ərzində ümumilikdə təxminən 2000 nəfər tələbə yazılı və test üsulu ilə imtahan verib.

İmtahan zallarında yanaşı oturan müxtəlif fakültələrin tələbələri ayrı-ayrı fənlərdən imtahan veriblər. Bu da onların bir-birinə kömək etmələrinin qarşısını alıb. İmtahanların nəticələrinin təlimata müvafiq olaraq tələbələrə çatdırılması təmin edilib. İmtahanların keçirildiyi binada qaydaqanunlara riayət olunmasını təmin etmək üçün professor-müəllim heyətinin tərkibindən fakültələr üzrə növbətçilər müəyyənləşdirilib. ADPU-nun filialları və ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci (ADPK) imtahan sessiyasının gedişi haqqında mütəmadi olaraq Tədris Departamentinə və rektorluğa məlumat veriblər.





Qeyd edək ki, 2016-2017-ci tədris ilindən başlayarq ADPU-ya qəbul olunmuş I tədris ili tələbələrinin və arzu edən digər tədris ili tələbələrinin kollokvium və semester imtahanları yazılı qaydada aparılır. Belə ki, yazılı imtahan üsulu tələbələrin semestr ərzində imtahan verəcəkləri fənlərin elmi və tədris-metodiki əsaslarına yiyələnmələrinə, başqa sözlə, həm semestr boyu, həm də imtahan ərəfəsində ciddi hazırlaşmalarına obyektv əsas verir. Tədris prosesindəki formallığı aradan qaldırır, ixtisasın elmi və metodik əsaslarına yiyələnmək əzmini yaradır.Yazılı imtahan tələbələrin fənlərin əsaslarını mənimsəmələrinə əsaslı stimul verir. Tələbələrin həm mühazirə, həm də seminar dərslərində fəallığına şərait yaradır, mühazirə və seminar dərslərinin elmi-metodik cəhətdən keyfiyyətliliyinə təkan verir. Yazılı imtahan imtahanlarda keyfiyyət faizinin əsaslı şəkildə yüksəlməsinə imkan yaradır, müəllimlərin elmi və metodiki cəhətdən hazırlıqlı olmalarını təmin edir, tələbələrin şifahi və yazılı nitqinin formalaşmasına səmərəli təsir göstərir.

Yazılı imtahanların yoxlanılması üçün xüsusi otaqlar ayrılıb. Yazılı imtahanlar başa çatdıqdan sonra yazılar şifrələnib, yoxlanılıb və həmin gün qiymətlər tələbələrə elan olunub. Günün sonunda isə bütün imtahanların nəticələri ADPU-nun İnternet saytına yerləşdirilib.

ADPU-nun rəhbərliyi auditoriyalarda olaraq imtahan prosesini müşahidə edib, imtahanların ədalətli, şəffaf və obyektiv keçirilməsi üçün öz tapşırıq və tövsiyələrini verib. Bütövlükdə imtahan sessiyası uğurla və şəffaf keçirilib.

**"Gənc müəllim"**

# 15 İyun-Milli Qurtuluş Gününə həsr olunmuş "Qurtuluşdan İntibaha" adlı tədbir

İyunun 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) və "Səs" Media Qrupunun birgə təşkilatçılığı ilə 15 İyun-Milli Qurtuluş Gününə həsr olunmuş "Qurtuluşdan İntibaha" adlı tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, Milli Məclisin deputatı Aydın Mirzəzadə, "Səs" Media Qrupunun rəhbəri, fəlsəfə üzrə fəlsəfə doktoru Bəhruz Quliyev, ziyalılar, universitetin müəllimləri iştirak ediblər. Əvvəlcə tədbir iştirakçıları ADPU-nun Heydər Əliyev Muzeyi ilə tanış olublar, sonra tədbir Heydər Əliyev məktəbinin lektoriyasında davam etdirilib. Toplantı iştirakçıları öncə "Səs" Media Qrupunun hazırladığı "Qurtuluşdan İntibaha" adlı filmə tamaşa ediblər.

"Səs" qəzetinin Baş redaktoru, fəlsəfə üzrə fəlsəfə doktoru Bəhruz Quliyev çıxışında 15 iyun Milli Qurtuluş ideologiyasının müstəqil Azərbaycanın davamlı inkişafında özünü büruzə verdiyini və ulu öndərimiz Heydər Əliyevin layiqli varisi, Azər-



baycan Prezidenti İlham Əliyevin müdrik, uzaqgörən siyasəti nəticəsində ölkəmizin regionda və dünyada nüfuzunun daha da artdığını bildirib.

Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov şərəfli, qürurverici dövlətçilik tariximizə Milli Qurtuluş Günü kimi daxil olmuş 15 İyunun əhəmiyyətindən danışıb. Bildirib ki, ümummilli lider Heydər Əliyevin yenidən hakimiyyətə qayıtması ilə Azərbaycan yeni bir mərhələyə daxil oldu. Ulu öndər Heydər Əliyevin müdrik, uzaqgörən siyasəti nəticəsində ölkəmizdə mövcud olan gərgin ictimai-siyasi böhran aradan qaldırıldı, sabitlik təmin edildi və iqtisadi inkişafa, tərəqqiyə nail olundu.

Böyük dövlət xadimi Heydər Əliyevin ictimai, siyasi, iqtisadi və mədəni həyatımızla bağlı ideyaları artıq Azərbaycanın gerçəkliyinə çevrilib. Ulu Öndərin müəyyən etdiyi müdrik siyasi kursu və strateji xətti Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev uğurla davam etdirir, ölkəmiz sürətlə inkişaf edir.

Milli Məclisin deputatı Aydın Mirzəzadə bildirib ki, ümummilli lider Heydər Əliyevin xalqın təkidi tələbi ilə yenidən hakimiyyətə qayıdışı Azərbaycan tarixində yeni bir səhifənin açılmasına səbəb oldu. Dahi dövlət xadiminin yenidən hakimiyyətə qayıdışı Azərbaycan xalqını müstəqilliyini itirmək təhlükəsindən xilas etdi. Heydər Əliyevin titanik səyləri nəticəsində Azərbaycanda sabitlik yarandı, xalqın dövlətə inamı möhkəmləndi, ölkəmizin inkişafı, vətəndaşının hüquq və azadlıqlarının təmin edilməsinə yol açıldı. Azərbaycan dünyanın nüfuzlu dövlətlərindən birinə çevrildi.

Baş redaktor bildirib ki, 1992-ci ildə ziyalıların xalqın adından "Səs" qəzeti vasitəsilə ümummilli lider Heydər Əliyevə müraciəti oldu. Həmin vaxtlar vəziyyətdən çıxış yolu kimi Naxçıvan Ali Məclisinin sədri Heydər Əliyev Bakıya dəvət edildi. Ulu Öndər ziyalıların müraciətinə yenə də "Səs" qəzeti vasitəsilə cavab verərək ölkənin düşdüyü vəziyyətdən çıxış yollarını göstərdi.

B.Quliyev qeyd edib ki, ulu öndər Heydər Əliyev xarizmatik bir lider olaraq Azərbaycanı qarşılaşdığı təhlükə və faciələrdən xilas etdi, müstəqil dövlətimizi qurdu, gücləndirdi, onu dünya miqyasında layiqincə tanıtdı. Bu gün dövlət başçımız İlham Əliyevin müstəqil və uğurlu xarici siyasət həyata keçirməsi Azərbaycanın beynəlxalq nüfuzunun artmasını təmin edib, ölkəmiz dünya birliyinin layiqli tərəfdaşlarından birinə çevrilib.

**Mənsur İbrahimli**

# Tanınmış filosof Əmrəli İsmayılovun kitabının təqdimatı

İyunun 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) tanınmış filosof alim, universitetin dosenti, fəlsəfə üzrə fəlsəfə doktoru Əmrəli İsmayılovun rus dilində yazdığı "Ermənilik və erməni faşizminin ideologiyası, fəlsəfəsi və cinayəti" adlı kitabının təqdimatı keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, Milli Məclisin Hüquq siyasəti və dövlət quruculuğu komitəsinin sədri Əli Hüseynli, fakültə dekanları, kafedra müdirləri, müəllimlər, ölkəmizin tanınmış və nüfuzlu ziyalılları iştirak ediblər.



Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, tanınmış filosof Əmrəli İsmayılov 5 monoqrafiyanın, 3 kitabın, 6 fundamental kitabın tərtibçisi, 11 kollektiv monoqrafiyanın müəlliflərindən biridir. Ə.İsmayılov çoxlu sayda respublika və beynəlxalq miqyaslı elmi simpoziumlarda, konfranslarda və seminar-



larda fəal çıxış edib. Ə.İsmayılovun rus dilində yazdığı "Ermənilik və erməni faşizminin ideologiyası, fəlsəfəsi və cinayəti" adlı kitabı zəngin elmi-tarixi faktlar əsasında qələmə alınıb və bu fundamental kitabı elmi ictimaiyyət böyük maraqla qarşılayıb. Onun bu genişhəcmli kitabının çapdan çıxması diqqətəlayiq elmi-tarixi hadisə kimi dəyərləndirilir. Bu kitab hər bir vətənpərvər azərbaycanlıya böyük hədiyyədir. Dərin elmi, siyasi və milli məzmuna malik olan bu kitabda ermənilyin, erməni faşizminin iç üzü açılır, erməni ideologiyasının mənfur, insanlığa zidd mahiyyəti, Ermənistanın təcavüzkar, işğalçı siyasətinin məqsədi, ermənilərin tarixən digər ölkələrə və xalqlara, qonşularına, ilk növbədə, Türkiyə və Azərbaycana qarşı əsassız ərazi iddiaları konkret faktlar əsasında nəzərə çatdırılır. Kitabın ən dəyərli cəhətlərindən biri ermənilərin siyasi riyakarlığının, yalançılığının, simasızlığının real elmi, publisistik mənbələr əsasında açıqlanmasıdır. Müəllif erməni ideologiyası, erməni faşizmi barədə fikirlərini əsaslandırmaq üçün məhz xristian aləmini təmsil edən mütəfəkkirlərin, dünyada tanınmış alim və siyasətçilərin fikirlərinə müraciət edib. Ermənilərin mənəviyyatsızlığı, riyakarlığı məhz erməni müəlliflərinin fikirləri, məlumatları əsasında oxucuya çatdırılır. Kitabda ermənilərin 1918-ci ilin martında Bakıda, Şamaxıda, Qubada və digər bölgələrdə törətdikləri qırğın-



lara hərtərəfli, real faktlar əsasında və dərindən aydınlıq gətirilir. Xocalı soyqırımına xüsusi diqqət yetirilir, yaşlılara, qadınlara və uşaqlara qarşı qəddar, amansız və qeyri-insani münasibət yalnız yazılı formada deyil, həm də çoxsaylı fotoşəkillər əsasında ifadə olunur. Kitab ermənilərin tarixini, bugününü, ideologiyasını, fəlsəfəsini, türklərə və azərbaycanlılara qarşı tarixi düşmənçiliyini bütün dolğunluğu ilə açan çox dəyərli kitabdır. Əsərin rus dilində yüksək səviyyədə yazılması onun geniş miqyasda yayılmasına kömək edir. Bu əsər erməni faşizmini ifşa edən sanballı, fundamental bir əsərdir.

Milli Məclisin Hüquq siyasəti və dövlət quruculuğu Komitəsinin sədri Əli Hüseynli çıxış edərək təqdimatın keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib. Qeyd edib ki, ölkəmizdə və xaricdə Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyi ilə bağlı müxtəlif tədbirlər keçirilir. Tarix boyu xalqımızın müstəqilliyinə ən böyük təhlükəni ermənilər yaradıb. Vətənpərvər alim Ə.İsmayılovun bu sistemli və dolğun əsəri erməni faşizminin ifşası baxımından mühüm əhəmiyyət kəsb edir.

Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov, professor İsmayıl Məmmədli, dosent Məcid Əfəndiyev, dosent Vahid Ömərov, dosent Sakit Əliyev, siyasi elmlər üzrə fəlsəfə



doktoru Nigar Qəhrəmanova və başqaları çıxış edərək əsərin yüksək səviyyəyə malik, xalqımızın milli maraqlarına xidmət edən və Azərbaycan həqiqətlərinin dünya ictimaiyyətinə çatdırılması baxımından mühüm əhəmiyyət kəsb edən bir əsər olduğunu vurğulayıblar.

Sonda Ə.İsmayılov çıxış edərək təqdimatın keçirilməsinə görə ADPU-nun rəhbərliyinə və çıxışçılara təşəkkür edib, bu sahədə alim-mütəxəssislərin fəaliyyətinin genişləndirilməsinin və daha çox əsərlərin yazılmasının vacibliyini bildirib.

**Mahirə Mustafayeva**

# “Türkdilli ölkələrdə təhsil və sosial elmlər” IV Beynəlxalq Simpoziumu

İyunun 28-29-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU), Azərbaycan Xalq Cümhuriyyətinin və Qafqaz İslam Ordusunun 100 illik yubileylərinə həsr edilmiş “Türkdilli ölkələrdə təhsil və sosial elmlər” IV Beynəlxalq Simpoziumu keçirilib. Beynəlxalq Simpoziumda Türkiyənin və Azərbaycanın aparıcı universitetlərinin tanınmış və nüfuzlu alim-mütəxəssisləri, AMEA-nın məsul şəxsləri, Türkiyə Respublikasının Baş Nazirliyinin Türk Əməkdaşlıq və Koordinasiya Agentliyinin (TİKA), Beynəlxalq Mədəniyyət və Dil Araşdırmaları Mərkəzinin, Türk Dünyası Təhsilçilər Birliyinin, Yunis Əmrə İnstitutunun və digər elmi müəssisə və təşkilatların təmsilçiləri iştirak ediblər. ADPU-nun rektoru, professor Cəfər Cəfərov “Türkdilli ölkələrdə təhsil və sosial elmlər” IV Beynəlxalq Simpoziumun keçirilməsi barədə müvafiq əmr imzalayıb. Həmin əmrə əsasən simpoziumun yüksək səviyyədə keçirilməsi məqsədilə 13 nəfərdən ibarət Təşkilat Komitəsi yaradılıb. Öncə qonaqlar Azərbaycan Xalq Cümhuriyyətinin fəaliyyətini və Qafqaz İslam Ordusunun xilaskarlıq missiyasını əks etdirən fotosərgi, eləcə də universitetdə fəaliyyət göstərən TÜRKSOY kafedrası, Heydər Əliyev Mərkəzi və Heydər Əliyev məktəbinin lektoriyası ilə tanış olublar, sonra simpozium universitetin Böyük Akt zalında







davam edib. Tədbirdə əvvəlcə Azərbaycanın və Türkiyənin Dövlət Himnləri səsləndirilib.

Beynəlxalq simpoziumun plenar iclasını giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, bu gün universitetimizin həyatında əlamətdar bir gündür. Bu Beynəlxalq Simpozium Azərbaycan və Türkiyənin birgə keçirdiyi böyük toplantıdır. Bu gün bütün Türk dünyasının böyük bayramıdır. Azərbaycanla Türkiyə arasında münasibətlər yüksək səviyyədə inkişaf edir. Elm, təhsil, mədəniyyət sahəsində keçirilən belə birgə tədbirlər dostluğumuzun, həmrəyliyimizin, qardaşlığımızın daha da gücləndirilməsinə xidmət edir. Azərbaycan və Türkiyənin siyasi həyatında böyük hadisələr baş



verib. Hər iki ölkədə Prezident seçkisi keçirilib. İnanırıq ki, yeni dönəmdə də Türkiyə və Azərbaycan münasibətləri dinamik inkişaf edəcək. Bu simpozium fikir və təcrübə mübadiləsi, əməkdaşlıq əlaqələrinin genişləndirilməsi baxımından böyük əhəmiyyət kəsb edir. Rektor çıxışının sonunda simpoziumun işinə uğurlar arzulayıb.

AMEA-nın vitse-prezidenti, Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutunun direktoru, akademik İsa Həbibbəyli çıxışında bildirib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Sərəncamı ilə 2018-ci il ölkəmizdə “Azərbaycan Xalq Cümhuriyyəti İli” elan edilib. Bu gün ADPU-da keçirilən simpozium həmrəyliyimizin, birliyimizin, qardaşlığımızın əyani ifadəsidir. Bu simpozium Türk dünyasının inteqrasiya prosesini əks etdirir. Türk dünyası birliyi dünya birliyinə töhfədir.

Yunis Əmrə İnstitutu Bakı Türk Mədəniyyət Mərkəzinin direktoru Cihan Özdəmir, Əlişir Nəvai adına Özbək Dili və Ədəbiyyatı Universitetinin rektoru, professor Şuxrat Siracədddinov və başqaları çıxış edərək simpoziumun Azərbaycan Xalq Cümhuriyyətinin və Qafqaz İslam Ordusunun 100 illik yubileylərinə həsr edilməsindən məmnunluq duyduqlarını bildiriblər.

Plenar iclasda Türk dünyasına xidmətə görə fərqlənən ziyalılara mükafatlar təqdim olunub, sonra simpozium öz işini Qafqaz İslam Ordusu bölməsində davam etdirib. İyunun 28-də beynəlxalq simpozium çərçivəsində “Azərbaycan Xalq Cümhuriyyətinin quruluşu” mövzusunda fotosərgi nümayiş etdirilib.

Daha sonra simpozium təqdimatlarla davam edib. Yüksək səviyyəli təqdimatlarda Azərbaycanın dövlətçilik tarixinin inkişaf mərhələləri, Azərbaycan Xalq Cümhuriyyətinin dövlətçiliyimiz tarixində tutduğu şərəfli yer və Qafqaz İslam Ordusunun xilaskarlıq fəaliyyəti, Türkdilli ölkələrdə təhsil və sosial elmlərin inkişafı, bu sahədə qarşıda duran əsas vəzifələr, inkişaf perspektivləri, demokratiya və qloballaşma şəraitində təhsilalanların müstəqil yaradıcı düşüncə qabiliyyətlərinin inkişafı, təhsil proqramlarının yenilənməsi, müəllim hazırlığı, xaricdə təhsil, multikultural cəmiyyət, multikulturalizmin Azərbaycan modeli, Türksoylu xalqların mədəni inteqrasiyası, Türkiyə-Azərbaycan münasibətləri və digər vacib məqamlar geniş əksini tapıb.

Qeyd edək ki, iyunun 29-da simpozium çərçivəsində “Tarixi dövrlərdə Osmanlı miniatürləri” mövzusunda sərgi keçirilib, Türk dünyasının gələcəyi bölməsində isə Türk xalqlarının gələcək inkişaf perspektivləri müzakirə edilib.

2 gün davam edən Beynəlxalq Simpozium iyunun 29-da başa çatıb. Simpoziumda edilən məruzələrin çap olunması nəzərdə tutulur. Onu da qeyd edək ki, beynəlxalq simpozium ölkəmizin elmi-mədəni həyatında mühüm hadisə kimi qiymətləndirilib, media tərəfindən geniş işıqlandırılıb.

**Mənsur Qüdrətoğlu**

# “Türkdilli ölkələrdə təhsil və sosial elmlər” IV Beynəlxalq Simpoziumun yekun iclası



Xəbər verdiyimiz kimi, iyunun 28-29-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Azərbaycan Xalq Cümhuriyyətinin və Qafqaz İslam Ordusunun 100 illik yubileylərinə həsr edilmiş “Türkdilli ölkələrdə təhsil və sosial elmlər” IV Beynəlxalq Simpoziumu keçirilib. Beynəlxalq Simpoziumda Türkiyənin və Azərbaycanın aparıcı universitetlərinin tanınmış və nüfuzlu alim-mütəxəssisləri, AMEA-nın məsul şəxsləri, Türkiyə Respublikasının Baş Nazirliyinin Türk Əməkdaşlıq və Koordinasiya Agentliyinin (TİKA), Beynəlxalq Mədəniyyət və Dil Araşdırmaları Mərkəzinin, Türk Dünyası Təhsilçilər Birliyinin, Yunis Əmrə İnstitutunun və digər elmi müəssisə və təşkilatların təmsilçiləri iştirak ediblər. İyunun 29-da simpoziumun yekun iclası keçirilib.

ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professoru Asəf Zamanov çıxış edərək bildirib ki, dövlət başçımız cənab İlham Əliyevin müvafiq Sərəncamı ilə 2018-ci il ölkəmizdə “Azərbaycan Xalq Cümhuriyyəti İli” elan edilib. Bu Sərəncamın icrası ilə əlaqədar olaraq həm Azərbaycanda, həm də xaricdə bir çox tədbirlər keçirilib. “Türkdilli ölkələrdə təhsil və sosial elmlər” IV Beynəlxalq Simpoziumu da bu Sərəncama uyğun keçirilən tədbirdir. Beynəlxalq simpozium yüksək səviyyədə keçib və uğurla yekunlaşıb.

Türk Tarix Qurumu başqanı Refik Turan, Adnan Menderes Universitetinin professoru Asuman Seda Saracaloğlu, Biruni Universitetinin Təhsil fakültəsinin dekanı, professor Adnan Ömerustaoğlu, Bakı Dövlət Universitetinin Türkologiya kafedrasının müdiri, professor Ramiz Əskər çıxış edərək beynəlxalq simpoziumun keçirilməsini Türk dünyası üçün böyük hadisə kimi qiymətləndiriblər və səmimi, mehriban, qonaqpərvər münasibətə görə ADPU-nun rəhbərliyinə təşəkkür ediblər.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov yekun çıxışında bildirib ki, böyük elm və təhsil məbədi olan ADPU yenə gözəl günlər yaşadı. ADPU ölkəmizdə ilk anadilli ali təhsil müəssisəsidir. Fəaliyyət göstərdiyi müddət ərzində 150 mindən çox pedaqoji kadr lazırlayıb. ADPU-nun böyük, məşhur məzunları olub. AMEA-nın 10 prezidentinin 3-ü - Yusif Məmmədəliyev, Həsən Abdullayev, Zahid Xəlilov, 2 vitse-prezidenti - Heydər Hüseynov və Səməd Vurğun ADPU-nun məzunlarıdır. Ölkə rəhbərliyi müəllim hazırlığına xüsusi diqqət yetirir. Üç ilə yaxındır ki, Azərbaycan Müəllimlər İnstitutu filialları ilə birlikdə ADPU-ya qoşulub. Azərbaycan Dövlət Pedaqoji Kolleci ADPU-nun nəzdində fəaliyyət göstərir. Geniş şəbəkəyə malik olan ADPU-da 18 mindən çox tələbə təhsil alır. Müəllim hazırlığı ölkənin, xalqın milli təhlükəsizlik məsələsidir. Universitetimizin kollektivi yüksək səviyyəli pedaqoji kadrlar hazırlamaq üçün əzmlə fəaliyyət göstərir. Belə beynəlxalq tədbirlər bu vacib vəzifənin həyata keçirilməsində önəmli rol oynayır. ADPU-nun kollektivi bu beynəlxalq tədbirin yüksək səviyyədə keçirilməsindən qürur duyur. Rektor çıxışının sonunda beynəlxalx simpoziumun keçirilməsində əməyi olan hər kəsə təşəkkür edib və onlara uğurlar arzulayıb.

Sonda xatirə şəkli çəkdirilib, daha sonra iştirakçılar TÜRKSOY-un Rəşid Behbudov adına Dövlət Mahnı Teatrında təşkil etdiyi konsert proqramını izləyiblər.

Qeyd edək ki, beynəlxalq simpozium ölkəmizin elmi-mədəni həyatında mühüm hadisə kimi qiymətləndirilib, media tərəfindən geniş işıqlandırılıb. Simpoziumda edilən məruzələrin çap olunması nəzərdə tutulur.

**Könül Nərimanqızı**

# ADPU-nun əməkdaşları PETRA layihəsi çərçivəsində Finlandiyada keçirilmiş növbəti təlimdə iştirak ediblər



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) əməkdaşları-Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi Günay Məhərrəmova, İnformasiya və kommunikasiya texnologiyaları şöbəsinin Texniki xidmət bölməsinin müdiri Rüfət Əliyev 27 may-1 iyun 2018-ci il tarixlərində PETRA layihəsi çərçivəsində Finlandiyanın Jivaskala şəhərində yerləşən Jivaskala Universitetində keçirilmiş növbəti təlimdə iştirak ediblər.

“Azərbaycan universitetlərində tədris və təlim təkmilləşdirilməsi” (Promoting Excellence in Teasching and Learning in Azerbaijani Universities - PETRA) layihəsi çərçivəsində “Tədris və təlim prosesində texnologiyadan istifadənin genişləndirilməsinin yayılması” mövzusunda keçirilmiş görüş tərəfdaş universitetlərin, o cümlədən Jivaskala Universitetinin təcrübəsini öyrənmək məqsədilə həyata keçirilib. Azərbaycandan və Avropadan ümumilikdə 14 tərəfdaş ali məktəblərin nümayəndələrinin iştirak etdikləri sayca dördüncü görüş maraqlı və faydalı proqram üzrə keçirilmiş təlim və seminarlarla yadda qalıb.

Azərbaycan universitetlərində təlim prosesinin təkmilləşdirilməsi, universitetin öyrənmə-öyrətmə prosesi ilə bağlı ehtiyaclarının müəyyənləşdirilməsi və onların daxili müzakirəsinin aparılması məqsədini daşıyan layihə çərçivəsində keçirilən növbəti görüşdə elektron tədris, təlim, bu sahədə mövcud olan vasitələr, tədqiqat işlərinin xüsusi məlumat bazasında saxlanılması haqqında təqdimatlar keçirilib

Təlimin ilk günündə açılış və salamlama nitqindən sonra Jivaskala Universitetində elektorn tədris və təlim prosesinin vəziyyəti, bu sahədə əldə olunmuş nailiyyətlər və imkanlar haqqında təqdimatlar nümayiş olunub, müzakirələr aparılıb.

Sonra həmin universitetin əməkdaşları tərəfindən “Moodle” sisteminə giriş, müəllimlərin tədris prosesində texnologiyadan istifadə bacarıqları, təhsil ixracı ilə bağlı təcrübələr haqqında təqdimatlar olub və müzakirələr keçirilib. Bununla yanaşı, görüşün ikinci günündə ispaniyalı koordinatorun rəhbərliyi ilə sözügedən layihənin icrası ilə bağlı universitetlərin nümayəndələrinin iştirak etdikləri iclas da keçirilib. Növbəti gün isə “Open access”, verilənlər bazası və informasiyanın axtarışı və ora daxil olma prosesi nümayiş etdirilib.

Təlimin son iki günündə isə “Moodle” proqramı, ondan onlayn istifadə ilə bağlı seminarlar keçirilib və sonda alınan nəticələr müzakirə olunub. Hər bir tərəfdaş universitetdən olan nümayəndələrə “Moodle” proqramının tətbiqi ilə bağlı strateji planlaşdırmanın aparılması və izah edilməsi üzrə verilmiş tapşırıqla bağlı qrup işi həyata keçirilib və təmsilçilər, o cümlədən ADPU-nun nümayəndələri müəyyən təqdimat hazırlayaraq təqdim ediblər.

Görüş çərçivəsində finlandiyalı nümayəndələr və bələdçi tərəfindən universitet şəhərciyində gəzinti təşkil olunub, görüş iştirakçıları Jivaskala Universitetinin Yuvasyarve gölünün sahilində yerləşən yeni tədris binaları, kitabxanası ilə, eləcə də 1863-cü ildən fəaliyyətə başlamış Jivaskala Müəllimlər Seminariyanının binasında universitetin tarixininin nümayiş etdirildiyi Pedaqoji Muzeylə tanış olublar.

PETRA layihəsi çərçivəsində Finlandiyanın Jivaskala Universitetində keçirilmiş növbəti görüşün sonunda bütün iştirakçılara, o cümlədən, ADPU-nun nümayəndələrinə müvafiq sertifikatlar təqdim olunub.

# ADPU-da maarifləndirici tədbir

**İyunun 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) işəgötürənlərin iştirakı ilə "Pərakəndə ticarət iqtisadi fəaliyyət sahəsi üzrə qeyri-rəsmi əmək münasibətlərinin leqallaşdırılması, istirahət vaxtı, işçilərin məzuniyyət hüquqları və məzuniyyət hüquqlarının təmin edilməsi" mövzusunda maarifləndirici tədbir keçirilib.**

Tədbiri giriş sözü ilə açan ADPU-nun İnzibati və iqtisadi işlər üzrə prorektoru Ümid Mehdiyev bildirib ki, belə aktual mövzuda maarifləndirici tədbirin ölkəmizin ali təhsil sistemində xüsusi yeri və mövqeyi ilə seçilən, böyük professor-müəllim və tədris-köməkçi heyətə malik olan ADPU-da keçirilməsi təqdirəlayiqdir. Ümid Mehdiyev universitetin kollektivi adından bu maarifləndirici tədbirin keçirilməsinə görə Əmək və Əhalinin Sosial Müfadiəsi Nazirliyinin rəhbərliyinə, Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyi yanında Dövlət Əmək Müfəttişliyi Xidmətinin məsul şəxslərinə təşəkkür edib. Qeyd edib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin uğurla həyata keçirdiyi sosial-iqtisadi siyasət nəticəsində ölkəmizdə yeni iş yerlərinin açılması daimi xarakter alıb, əhalinin məşğulluq səviyyəsi artıb, əmək bazarında sabitlik və inkişaf sürətlənib, azad sahibkarlıq inkişaf edib, əlverişli biznes və investisiya mühiti formalaşıb. Bu baxımdan, əmək qanunvericiliyinə əməl olunmasına dövlət nəzarəti sisteminin təkmilləşdirilməsi vacib əhəmiyyət kəsb edir. Qeyri-rəsmi məşğulluğun qarşısının alınması, əmək hüquqlarının təminatına nəzarət mexanizminin qabaqcıl beynəlxalq təcrübə əsasında formalaşması olduqca vacibdir. Bütövlükdə əmək bazarı iştirakçılarının qanuni hüquq və mənafelərinin qorunması, əmək bazarının iqtisadi inkişaf prosesinə uyğun tənzimlənməsi ölkəmizin sosial-iqtisadi inkişafına öz dəyərli töhfələrini verər.





Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyi yanında Dövlət Əmək Müfəttişliyi Xidmətinin (DƏMX) rəis müavini Anar Quliyev çıxış edərək tədbirin keçirilməsinə verdiyi dəstəyə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib.

Tədbirdə 4 saylı region üzrə Dövlət Əmək Müfəttişliyinin (DƏM) rəis müavini Məzahir Cəmşidov "Qeyri-rəsmi əmək münasibətlərinin leqallaşdırılması" mövzusunda çıxış edib. M.Cəmşidov qeyd edib ki, qeyri-rəsmi məşğulluqla mübarizə inkişaf səviyyəsindən asılı olmayaraq bütün ölkələrdə əsas hədəflərdəndir. Qeyri-rəsmi əmək bazarı bütün dünya ölkələrində mövcuddur. Ölkəmizdə işəgötürən-işçi münasibətlərinin rəsmiləşdirilməsi, əməyin ödənişinin təşkilinə nəzarət mexanizmlərinin təkmilləşdirilməsi sosial-iqtisadi siyasətin tərkib hissəsidir. Qeyri-rəsmi məşğulluqla mübarizənin gücləndirilməsində əmək, mülki, vergi və inzibati qanunvericiliyin təkmilləşdirilməsi, maliyyə sanksiyalarının və cərimələrin sərtləşdirilməsi, nəzarət mexanizmlərinin təkmilləşdirilməsi, ictimai təşkilatların və sosial tərəfdaşların fəaliyyətinin gücləndirilməsi, əmək bazarına nəzarət üzrə məlumat-informasiya ehtiyatının formalaşdırılması olduqca vacibdir.

"Məzuniyyət hüququnun həyata keçirilməsi qaydaları" mövzusunda çıxış edən 4 saylı region üzrə DƏM-in baş əmək müfəttişi Müşfiq Məmmədov bu barədə ətraflı məlumat verib. M.Məmmədov bildirib ki, Azərbaycan Respublikası Konstitusiyasının 37-ci maddəsinə əsasən hər kəsin istirahət hüququ vardır. Məzuniyyət hüququ ilə bağlı müddəalar ölkəmizin tərəfdaş çıxdığı beynəlxalq hüquqi aktlarda da öz əksini tapmışdır. Əmək müqaviləsi ilə işləyənlərə qanunla müəyyən edilmiş, lakin gündə 8 saatdan artıq olmayan iş günü, istirahət və bayram günləri, ildə azı bir dəfə 21 təqvim günündən az olmayan ödənişli məzuniyyətin verilməsi təmin edilir. Məzuniyyətin verilməsi barədə əmr məzuniyyətin başlanmasına azı beş gün qalmış verilir. Əmək məzuniyyətlərinin verilməsinin düzgünlüyünün təmin olunması məqsədilə məzuniyyətlərin uçotu işçilərin iş illəri üzrə aparılmalıdır.

Tədbirdə iştirakçıları maraqlandıran suallar cavablandırılıb.

**Orxan Abdullayev**

## ADPU-nun əməkdaşları ADA Universitetində keçirilmiş 3-cü Beynəlxalq Elmi Təhsil Konfransında iştirak ediblər

İyunun 7-8-də ADA Universitetində "Təhsilin strateji planlaşdırılması: Düşüncələr və perspektivlər" adlı 3-cü Beynəlxalq Elmi Təhsil Konfransı keçirilib. "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət strategiyası"nın 5 illiyinə həsr olunmuş beynəlxalq konfransda Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov, Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi, fizika üzrə fəlsəfə doktoru Lətif Kəngərlinski və universitetin bir neçə müəllimi iştirak ediblər.












Azərbaycan Respublikasının Təhsil Nazirliyi və Avropa İttifaqının Bakıdakı nümayəndəliyinin dəstəyi ilə keçirilən ikigünlük konfransın açılış mərasimində çıxış edən Təhsil naziri Ceyhun Bayramov Azərbaycanın ən qabaqcıl universitetlərindən biri olan ADA Universitetində belə konfransın keçirilməsinin çox əhəmiyyətli olduğunu vurğulayıb.Nazir C.Bayramov dövlət strategiyasının qəbulundan ötən beş il yaxın müddətdə bir çox işlərin görüldüyünü, təhsilin məzmunu sahəsində nailiyyətlər əldə edildiyini bir sıra nümunələrlə əsaslandırıb.

Sonra çıxış edən Dövlət İmtahan Mərkəzinin Direktorlar Şurasının sədri Məleykə Abbaszadə qeyd edib ki, gələn il bütün təhsil sistemi üçün çox böyük əhəmiyyətli il olacaq. Belə ki, gələn il 9-cu siniflərlə yanaşı, 11-ci sinif şagirdləri də yeni proqramlar üzrə buraxılış imtahanı verəcəklər.

Daha sonra Böyük Britaniyanın Oksford Universitetinin professoru Deyvid Briksin konfrans üçün videomüraciəti nümayiş etdirilib. Tədbirdə çıxış edən ADA Universitetinin prorektoru Vəfa Kazdal qeyd edib ki, təhsil sahəsində uğurların olması üçün uzun müddət lazımdır. O, konfransda milli ekspertlərlə yanaşı, xarici ekspertlərin də çıxış edəcəyini və öz fikirlərini bölüşəcəklərini vurğulayıb. "Təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın qəbul olunmasından beş il ötdüyü bir vaxtda, təlim-tədrisin keyfiyyətinin daha da artırılması məqsədilə təhsil sahəsində çalışanların Strategiyanın həyata keçirilməsi prosesi ilə tanış olması, əldə edilmiş uğurlara nəzər salması, çatışmazlıqların aradan qaldırılması ilə bağlı təşəbbüs göstərməsi böyük önəm daşıyır.

Qeyd edək ki, əsasən inngilis dilində hazırlanmış təqdimatlardan ibarət olan beynəlxalq konfransda "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"na dair dörd istiqamətdə - "Bacarıqlara əsaslanan təhsil məzmununun inkişaf etdirilməsi", "Təhsil sistemində insan resurslarının müasirləşdirilməsi", "Şəffaf və səmərəli idarəetmə mexanizmlərinin formalaşdırılması" və "Son texnoloji tələblərə cavab verən infrastrukturun yaradılması" panelləri ətrafında müzakirələr aparılıb.

İki gün ərzində konfrans iştirakçıları təhsil sahəsində nüfuzlu beynəlxalq ekspertlərdən təhsilin müxtəlif səviyyələrində tətbiq edilən beynəlxalq təcrübə ilə tanış olub, onların rəylərini dinləyiblər.

Konfrans çərçivəsində ADA Universitetinin Təhsil İnstitutunun bu il "Təhsilin idarə edilməsi" ixtisası üzrə məzunlarının diplom və magistr işləri, apardıqları elmi araşdırmanın nəticələri ətrafında hazırladıqları posterlər qarşısında da fikir mübadiləsi aparılıb.

## Məzun Gününə həsr edilmiş tədbir

İyunun 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Məzun Gününə həsr edilmiş tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, professor-müəllim heyəti və məzunların valideynləri iştirak ediblər. Tədbirdə əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.

Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov məzunları və onların valideynlərini bu əlamətdar və xoş gün münasibətilə təbrik edib, məzunlara gələcək həyatlarında və müqəddəs müəllimlik fəaliyyətlərində uğurlar arzulayıb, onların gələcəkdə müstəqil ölkəmizin hərtərəfli inkişafına öz layiqli töhfələrini verəcəklərinə əminliyini ifadə edib.

Rektor Cəfər Cəfərov qeyd edib ki, müəllimlik şərəfli, müqəddəs, eyni zamanda çətin və məsuliyyətli bir peşədir. Müəllimin insan həyatında çox böyük rolu var. Müəllimlər xalqın, millətin, ölkənin gələcəyini müəyyən edirlər. Müasir Azərbaycanın qurucusu, ümummilli liderimiz Heydər Əliyev müəllim peşəsini yüksək qiymətləndirərək demişdir: "Həyatını müəllimliyə həsr edən insanlar, həqiqətən, fədakar, xalqına, millətinə sədaqətli və eyni zamanda qəhrəmanlıq göstərən insanlardır. Bizim həyatımızda müəllimlik ən hörmətli peşədir. Müəllim cəmiyyətimizdə görkəmli yer tutur. Orta məktəbdə, ali məktəbdə hər bir müəllim bilməlidir ki, onun üzərinə düşən vəzifə, onun dövlət üçün, millət üçün, Azərbaycan xalqı üçün gördüyü iş bütün başqa sahələrdə fəaliyyət göstərən insanların hamısının işindən ən gərəklisidir, ən lazımlısıdır. Azərbaycan ziyalıları arasında müəllimlər xüsusi yer tuturlar, hörmətə layiqdirlər, xüsusi qayğı və diqqətə əhatə olunmalıdırlar. Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram".






Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev demişdir: "Təhsil hər bir dövlətin gələcəyidir. Hər bir ölkənin inkişaf dinamikasının hərəkətverici qüvvəsi təhsildir, elmdir, texnologiyalardır, innovasiyalardır. Təbii resurslar yox, məhz təhsil. Buna görə də Azərbaycanda təhsilin səviyyəsi daha da yüksəlməlidir, təhsilin səviyyəsi dünyanın ən yüksək standartlarına cavab verməlidir. Təhsilin səviyyəsinin yüksəldilməsi ölkəmizin uzunmüddətli, dayanıqlı inkişafını təmin edəcəkdir. Bizim gənclərimiz bilikli, peşəkar və vətənpərvər olmalıdırlar. Bu amillərin sintezi ölkəmizin gələcək uğurlu inkişafını şərtləndirəcəkdir".



Azərbaycan Prezidenti cənab İlham Əliyev müəllim adına, müəllim əməyinə yüksək qiymət verir. Dövlət başçımız demişdir: "Müəllimlər Azərbaycan cəmiyyətinin elitasıdır". Azərbaycanın Birinci vitse-prezidenti Mehriban xanım Əliyeva elm və təhsilin inkişafında əvəzsiz xidmətlər göstərir. Təhsil Nazirliyi tərəfindən "Gələcəyin müəllimi təqaüdü" təsis edilib. Bu təqaüd pedaqoji kadr hazırlığı aparılan ali təhsil müəssisələrinə qəbul imtahanlarında 500 və daha yüksək bal toplayan, ixtisas seçimində birinci və ya ikinci yerdə müəllimlik ixtisasını qeyd edən tələbələrə şamil olunur.

Rektor bildirib ki, bu il ADPU-nu 8 fakültə üzrə əyani təhsilalma forması üzrə 1704 nəfər, 7 fakültə üzrə qiyabi təhsilalma forması üzrə isə 179 nəfər (cəmi 1883 nəfər) məzun bitirir. Builki tədris ilində ADPU-nun Ağcabədi Filialını əyani təhsilalma forması üzrə 3 ixtisas üzrə 79 nəfər, qiyabi təhsilalma forması üzrə isə 1 ixtisas üzrə 11 nəfər (cəmi 90 nəfər), Cəlilabad Filialını əyani təhsilalma forması üzrə 4 ixtisas üzrə 81 nəfər, qiyabi təhsilalma forması üzrə isə 1 ixtisas üzrə 23 nəfər (cəmi 104 nəfər), Şəki Filialını əyani təhsilalma forması üzrə 7 ixtisas üzrə 239 nəfər, Şamaxı Filialını əyani təhsilalma forması üzrə 4 ixtisas üzrə 79 nəfər, qiyabi təhsilalma forması üzrə isə 1 ixtisas üzrə 16 nəfər (cəmi 95 nəfər), Quba Filialını əyani təhsilalma forması üzrə 5 ixtisas üzrə 110 nəfər, qiyabi təhsilalma forması üzrə isə 1 ixtisas üzrə 26 nəfər (cəmi 136 nəfər) məzun bitirir. Ümumilikdə bu il ADPU-nun 5 filialını 664 nəfər məzun bitirir. Builki tədris ilində universitetin magistraturasını 23 ixtisas, 25 ixtisaslaşma üzrə 401 nəfər magistr bitirir. Bu il ADPU-nun SABAH qruplarını 2 ixtisas üzrə 27 nəfər məzun bitirir. Cari ildə universiteti ali təhsilin bakalavriat səviyyəsi üzrə 5 ixtisas üzrə 19 nəfər, magistratura səviyyəsi üzrə isə 2 ixtisas üzrə 4 nəfər (cəmi 23 nəfər) əcnəbi tələbə bitirir. ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecini (ADPK) isə 7 ixtisas üzrə əyani təhsilalma forması üzrə 495 nəfər, qiyabi təhsilalma forması üzrə isə 83 nəfər (cəmi 578) məzun bitirir. Bütövlükdə bu il ADPU-nu filiallar və ADPK ilə birlikdə 3576 nəfər məzun bitirir.

Tələbə Gənclər Təşkilatının sədri Taleh Budaqov akamedik göstəriciləri yüksək olan və sosial fəallığına görə xüsusi fərqlənən məzunlar haqqında məlumat verib, onlara plaketlər təqdim edilib.

Tədbir məzun-gənclərin hazırladıqları bədii-musiqili kompozisiya və tanınmış incəsənət ustalarının iştirakı ilə konsert proqramı ilə davam edib.

**Mahirə Mustafayeva,**
**Könül Nəzərova**

# Fizika və texnologiya fakültəsinin Elmi Şurasının iclası

**İyunun 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika və texnologiya fakültəsinin Elmi Şurasının iclası keçirilib. Elmi Şuranın iclasının gündəliyinə aşağıdakı məsələlər daxil edilib: Yaz imtahan sessiyasına hazırlığın vəziyyəti haqqında, 08.03.2108-ci il tarixdə "Azərbaycan müəllimi" qəzetində dərc olunmuş elana əsasən kafedralarda vakant olan professor, dosent, baş müəllim və müəllim vəzifələrini tutmaq üçün müsabiqədə iştirak edənlərin seçkilərinin keçirilməsi, cari məsələlər.**

Elmi Şuranın iclasını giriş sözü ilə açan fakültənin dekanı, dosent Arzu Daşdəmirov gündəlikdə duran birinci məsələyə keçməzdən öncə bu il IV tədris ili tələbələrinin pedaqoji təcrübələrinin uğurla keçməsində yaxından iştirak etmiş və təşkilində dəstək olduqları üçün 9 nömrəli tam orta məktəbin direktoru Zinyət Əhmədovaya, fizika müəllimi Sona Hacılıya, 189-190 nömrəli tam orta məktəbin fizika müəllimi Qəndab Abbasovaya, Kimya-biologiya liseyinin direktoru Kamran Rəhimova, həmin liseyin fizika müəllimi Sənani Süleymanova, 23 nömrəli tam orta məktəbin müəllimi Mətanət Səfərovaya, 132-134 nömrəli Təhsil Kompleksinin müəllimləri Xəyalə Muradovaya və Hikmət Mehdiyevə fakültənin rəhbərliyi adından təşəkkürnamələri təqdim edib.

Sonra dekan, dosent A.Daşdəmirov ADPU-nun Elmi Şurasında yaz semestrinin imtahan sessiyasına hazırlığın vəziyyəti haqqında Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanovun hesabatında qeyd edilən məsələləri Şura üzvlərinin nəzərinə çatdırıb. İmtahan prosesinin təşkilində və keçirilməsi zamanı kafedra müdirləri və fənn müəllimlərinin vəzifələrini qeyd edib.O, imtahanların şəffaf və obyektiv keçirilməsi üçün bütün şəraitin yaradıldığını deyib.

Kafedraların imtahan sessiyasına hazırlığı ilə əlaqədar Ümumi fizika kafedrasının müdiri, dosent Cahangir Hüseynovun, Fizikanın tədrisi metodikası kafedrasının müdiri, dosent Səvinc Cəlilovanın, Texnologiya və onun tədrisi metodikası kafedrasının müdiri, dosent Səadət Musayevanın hesabatları dinlənilib. Elmi Şura üzvləri fakültənin imtahan sessiyasına hazırlığının vəziyyətini qənaətbəxş qiymətləndiriblər.





Gündəlikdə duran ikinci məsələ ilə əlaqədar fakültənin dekanı, dosent A.Daşdəmirov seçki prosesinə hazırlığın necə keçirilməsini xronoloji ardıcıllıqla Elmi Şura üzvlərinin diqqətinə çatdırıb. O, qeyd edib ki, fakültədə 11 yerə 32 nəfər iddiaçı sənədlərini İnsan Resursları şöbəsinə təqdim edib. Sənədlərin Əsasnaməyə uyğun təqdim edilməsi kafedralarda yoxlanılıb və tələblərə uyğun olmayanların sənədləri geri qaytarılıb.

Texnologiya və onun tədrisi metodikası kafedrasına 14 nəfər sənəd verib, müvafiq elmi-pedaqoji stajı olmadığına və ixtisası uyğun gəlmədiyinə görə 6 nəfərin: Abdulov Şükür Cəbi oğlunun, Süleymanlı Aytən Vəliş qızının, Bəhmənova Aygün Gülağa qızının, Məmmədova Dürdanə Qamət qızının, Məmmədova Nuran Əkbər qızının və Nəcəfova Arzu Təhmasib qızının sənədlərinin qəbulundan imtina edilib. Müsabiqəyə çıxarılmış 2 vakant dosent vəzifəsi yerinə 3 nəfər sənəd verib. 2 müəllim və ya baş müəllim yerinə isə 5 nəfərin sənədləri qəbul edilib. Sonradan Əzizov Sarvan Şirvan oğlu müsabiqədə iştirak etməkdən imtina edib və sənədlərini geri götürmək haqqında ərizə ilə müraciət edib. Hazırda seçkiyə 7 nəfər buraxılır.

Ümumi fizika kafedrasında müsabiqəyə çıxarılmış 4 nəfər vakant baş müəllim və ya dosent vəzifəsi yerinə 12 nəfər sənəd verib. Onlardan 2 nəfər-Babayev Əziz Hümbət oğlu və Dadaşov İltifat Şabanəli oğlu ADPU-nun Elmi Şurasının yaşı 70 və 70-dən çox olan əməkdaşlarla kafedralarda dərs yükünün olduğu təqdirdə 1 illik müqavilə bağlanılması barədə qərarına müvafiq olaraq müsabiqədə iştirak etməkdən imtina etmələri barədə ərizə ilə müraciət edibər. Hazırda 4 yerə 10 nəfər sənəd verib.

Fizikanın tədrisi metodikası kafedrası üzrə 1 vakant dosent və ya professor yerinə 1 nəfər-Əlizadə Şükür Həmid oğlu, 2 baş müəllim və ya dosent yerinə isə Vahidov Tacəddin Siracəddin oğlu, Əliyev Natiq Ağarza oğlu, Əliyev Ağaxəlil Ələsgər oğlu, Cəfərov Tapdıq Aslan oğlu və Şərifov Qalib Mövsüm oğlu sənədlərini təqdim ediblər. Sonradan Tacəddin Vahidov ADPU-nun Elmi Şurasının yaşı 70 və 70-dən çox olan əməkdaşlarla kafedralarda dərs yükünün olduğu təqdirdə 1 illik müqavilə bağlanılması barədə qərarına müvafiq olaraq müsabiqədə iştirak etməkdən imtina etməsi barədə ərizə ilə müraciət edib. Müsabiqədə 5 nəfər iştirak edir.

Sənədlərin uyğunluğu yoxlanıldıqdan sonra şəffaflığın və ədalətli seçki prosesinin təmin olunması məqsədilə iddiaçılarla görüş keçirilib, müsabiqənin və püşkatmanın keçirilməsi qaydaları, şərtləri haqqında onlara ətraflı məlumat verilib. Həmin görüşdə iddiaçı Məmmədov İsrail Musa oğlunun tədris prosesindən uzun müddət uzaqlaşması səbəbi ilə namizədlərin hamısının razılığı ilə ona püşkatmada iştirak etmədən birbaşa özünün istəyinə uyğun dərsi seçməsi və tədris etməsi digər iddiaçılarla razılaşdırılıb. Kafedraların təqdim etdikləri cədvələ müvafiq olaraq püşkatma 3 gün əvvəlcədən keçirilib və iddiaçıların nümunəvi dərslərinin videoçəkilişi aparılıb.

Fizikanın tədrisi metodikası kafedrasının professoru Şükür Əlizadə səhhətində yaranmış problemlərlə bağlı olaraq, dərsinin videoçəkilişinin aparılması əvəzinə dekan, kafedra müdiri və kafedranın fənn komissiyasının iştirakı ilə dinlənilməsinin keçirilməsi haqqında ərizə ilə müraciət edib və tədris işləri üzrə prorektorun müvafiq icazəsi ilə açıq dərsin bu cür dinlənilməsinə icazə verilib.

Daha sonra kafedralarda iddiaçıların açıq dərslərinə baxış keçirilib, müvafiq qiymətləndirmə meyarlarına uyğun qiymətləndirilmə aparılıb. Qiymətləndirmə aparıldıqdan sonra elə yerindəcə ballar hesablanıb, iddiaçılara və kafedra əməkdaşlarına qiymətləndirmənin orta balı elan edilib. Əsasnamənin 3.4 bəndinə əsasən, kafedralardan hər bir namizəd haqqında onun elmi, elmi-pedaqoji, ictimai və nümunəvi dərsinin qiymətləndirilməsi də nəzərə alınmaqla əsaslandırılmış rəylər Elmi Şuraya təqdim edilib.Texnologiya və onun tədrisi metodikası kafedrasında qiymətləndirilmənin nəticələri barədə əvvəlcə 1 iddiaçının şikayətinə qiymətləndirilmənin səhərisi gün çağırılan təcili iclasda Tədris Depatamentinin direktoru, dosent Sənan Əliyevin iştirakı ilə baxılıb, şikayətin əsassız olduğu aydınlaşdırılıb. Sonra daha 2 iddiaçının iradı daxil olub. Bu iradlar kafedranın növbədənkənar iclasında araşdırılıb və obyektivliyin təmin olunmaması, qiymətləndirmə zamanı şişirdilmiş balların verilməsi üzündən bütün iddiaçıların qiymətləndirilməsinin nəticələri ləğv edilib və günahkarlar cəzalandırılıb. Digər 2 kafedradan-Ümumi fizika və Fizikanın tədrisi metodikası kafedralarından püşkatma, nümunəvi dərsin keçirilməsi, nəticələrin qiymətləndirilməsi barədə heç bir şikayət və ya irad daxil olmayıb. Bütün bu deyilənlər Elmi Şurada seçkinin keçirilməsinə qədər şəffaf və ədalətli, hər kəs üçün uyğun şəraitin yaradılmasını bir daha sübut edir. Hesab edirəm ki, Elmi Şura üzvləri də vicdanla, məsuliyyətlərini dərk edərək ən layiqli namizədə səs verəcəklər.

Sonra Əsasnamənin 2.1 maddəsinə əsasən elmi katib hər bir namizəd haqqında rəyi ayrı-ayrı oxuyub. İddiaçıların adları verilən elana və ərizələrinə müvafiq olaraq, bülletenlərə daxil edilib.

Dekan A.Daşdəmirov Elmi Şura üzvlərinin nəzərinə çatdırıb ki, Əsasnamənin 2.5 bəndinə əsasən iştirak edənlərin 50%-dən az səsini toplayan namizədlər hətta 1-ci olsalar belə, seçilməmiş sayılırlar. Əsasnamənin 2.3 bəndinə əsasən namizədin lehinə namizədin adının saxlanılması, əleyhinə adının pozulması vasitəsilə bildirilir. Müsabiqə ilə əlaqədar şikayətlər seçkidən 15-gün keçənədək ADPU-nun rektoruna təqdim oluna bilər. Əsasnamənin 2.4 bəndinə əsasən Elmi Şura səsvermənin nəticələrini hesablamaq üçün səsvermədən əvvəl 3 nəfərdən ibarət hesablama komissiyası seçib. Bundan əlavə, səsvermənin gedişini müşahidə etmək üçün hər kafedradan 1 nəfər olmaqla müşahidəçilər qrupu müəyyən edilib. Səsvermədən sonra hesablama komissiyasının sədri, professor Vaqif Nəsirov say komissiyasının protokolunu oxuyub. Əsasnamənin 2.4 bəndinə görə hər bir namizəd üçün səsvermənin nəticələri ayrılıqda elan olunub, onun protokolu Elmi Şura tərəfindən mövcud qayda üzrə təsdiq edilib.

Sonda fakültənin dekanı, dosent A.Daşdəmirov müsabiqədən uğurla keçmiş müəllimləri təbrik edib və onlara uğurlar arzulayıb. Bununla da Elmi Şura öz işini sona çatdırıb.

# Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin Korreksiyaedici təlim kafedrasının əməkdaşlarının seminarı

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Sərəncamı ilə Səhiyyə Nazirliyi tərəfindən 2016-cı ildə regionlarda uşaqlara psixi sağlamlıq xidməti məqsədilə mərkəzlər yaradılmışdır. Belə mərkəzlər respublikanın altı regionunda yaradılmışdır. Bu regional mərkəzlərdən biri də Şirvan şəhərində fəaliyyət göstərir.



İyunun 9-da Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin Korreksiyaedici təlim kafedrasının müdiri, dosent Nailə Hüseynova və kafedranın müəllimi Səlbi Abasova, Şirvan Regional Uşaq Psixi Sağlamlıq Mərkəzində xüsusi qayğıya ehtiyacı olan uşaqlar üçün yaradılmış psixi sağlamlıq və reabilitasiya bölməsində fəaliyyət göstərən gənc mütəxəssisləri maarifləndirmə məqsədilə reabilitasiya zamanı istifadə olunan müasir avadanlıqların istifadə qaydalarına və ümumilikdə xüsusi qayğıya ehtiyaçı olan uşaqlarla reabilitasiya işinin qurulmasına aid seminar keçiriblər. Seminar maraqla qarşılanıb.

# İbtidai təhsil fakültəsinin Elmi Şurasının iclası

**İyunun 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İbtidai təhsil fakültəsinin Elmi Şurasının iclası keçirilib. Elmi Şuranın iclasında sonuncu tədris ili tələbələrinin pedaqoji təcrübəsinin yekunları, kafedralarda vakant olan dosent, baş müəllim və müəllim vəzifələrini tutmaq üçün müsabiqədə iştirak edənlərin seçkilərinin keçirilməsi və cari məsələlər müzakirə olunub.**





Elmi Şuranı giriş sözü ilə açan fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru, professor, Əməkdar elm xadimi Fərrux Rüstəmov sonuncu tədris ili tələbələrinin pedaqoji təcrübəsinin təşkili və keçirilməsi haqqında geniş məlumat verib. Pedaqoji təcrübənin yekunlarının pedaqoqların, metodistlərin və tələbələrin iştirakı ilə həm fakültədə, həm də universitetdə geniş müzakirə olunduğunu bildirib. Tələbə və müəllimlərin məktəb rəhbərləri tərəfindən fəxri fərmanla təltif olunduğunu bildirib. Sonra yaz imtahan sessiyası ilə bağlı görüləcək işlərdən danışıb. Qeyd olunub ki, qarşıda bizi daha ciddi sınaq - semestr və dövlət imtahanları gözləyir. İmtahanların şəffaf və obyektiv keçirilməsi üçün yaradılan şəraitdən maksimum istifadə etməliyik.

Professor Fərrux Rüstəmov kafedralarda vakant olan dosent, baş müəllim və müəllim vəzifələrini tutmaq üçün müsabiqədə iştirak edənlərin seçkilərinin keçirilməsini xronoloji ardıcıllıqla Elmi Şura üzvlərinin diqqətinə çatdırıb. Seçkinin prosedur qaydası ilə Elmi Şura üzvlərini tanış edib. Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasına 2 vakant baş müəllim vəzifəsi yerinə 4 nəfər, İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasına 3 vakant olan baş müəllim və ya dosent vəzifəsi yerinə 6 nəfər sənəd verib. Hər bir iddiaçının açıq dərsləri keçirilib. Müvafiq kafedralarda iddiaçıların açıq dərsləri, elmi-pedaqoji fəaliyyətləri qiymətləndirilib. Onların fəaliyyəti haqqında Elmi Şuraya çıxarış təqdim olunub. Kafedra müdirləri dosent Yaqut Rzayeva və dosent Samirə Tağıyeva iddiaçılarla bağlı yekun rəyləri səsləndiriblər. Professor Fərrux Rüstəmov Elmi Şurada iştirak edən iddiaçılara elmi-pedaqoji fəaliyyətləri və açıq dərsləri ilə bağlı nəyi əlavə etmək istədiklərini soruşub. İştirakçılar yekun rəylə razılaşdıqlarını bildiriblər. Sonra gizli səsvermə keçirilib. Səsvermədən sonra hesablama komissiyasının sədri, dosent Bəyməmməd Cəbrayılov səshesablayıcı komissiyasının protokolunu oxuyub. Hər bir namizəd üçün səsvermənin nəticələri ayrılıqda elan olunub, onun protokolu Elmi Şura tərəfindən mövcud qayda üzrə təsdiq edilib. Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasına 2 vakant baş müəllim vəzifəsinə pedaqogika üzrə fəlsəfə doktoru Rafik Alıyev və Oqtay Nəbiyev, İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasına 2 vakant olan dosent vəzifəsinə pedaqogika üzrə fəlsəfə doktoru, dosent Şahrza Ağayev, pedaqogika üzrə fəlsəfə doktoru, dosent Aybəniz Haşımova, 1 vakant olan baş müəllim vəzifəsinə Təranə Tağıyeva seçilmiş hesab olunub və qərarın təsdiqi universitet Elmi Şurasından xahiş olunub.

Sonda fakültə Elmi Şurasının sədri, professor Fərrux Rüstəmov müsabiqədən uğurla keçmiş müəllimləri təbrik edib və onlara uğurlar arzulayıb.

# «Əzizxan» şeir kitabının təqdimatı

İyunun 13-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya fakültəsinin Azərbaycan dili və onun tədrisi metodikası kafedrasında kafedranın professoru, filologiya üzrə elmlər doktoru Məhərrəm Hüseynovun «Əzizxan» şeir kitabının təqdimatı keçirilib. Tədbirdə kafedranın professor-müəllim heyəti iştirak edib. Qeyd edək ki, kitabın redaktoru filologiya üzrə elmlər doktoru, professor Təyyar Salamoğlu, «Ön söz»ün müəllifi isə Ağahəsən Bədəlzadədir.






Tədbiri giriş sözü ilə açan pedaqogika üzrə fəlsəfə doktoru Adil Balıyev bildirib ki, professor Məhərrəm Hüseynovun müəllifi olduğu «Əzizxan» poeması Azərbaycan dilçilik elmində xüsusi yeri olan dil tarixçisi, professor Əzizxan Tanrıverdiyə həsr olunub. 60 bəndlik bu şeir çələnginin hər bəndində müəllif yüksək məharətlə professor Əzizxan Tanrıverdinin yaradıcılıq yolunu, daxili portretini, yüksək mənəvi keyfiyyətlərini poetik dillə ifadə edib.

Tədbirdə filologiya üzrə elmlər doktoru, professor Fikrət Xalıqov «Əzizxan» poemasının təqdimatının keçirilməsini təbii bir hal kimi qiymətləndirərək qeyd edib ki, həm professor Məhərrəm Hüseynovun, həm də poemanın qəhrəmanı professor Əzizxan Tanrıverdinin yaradıcılığı, şəxsiyyəti ilə uzun illərdir ki, tanışdır. Bu əsər Azərbaycan aliminə verilən yüksək dəyərdir.

Pedaqogika üzrə elmlər doktoru Nabat Cəfərova çıxış edərək bildirib ki, Məhərrəm Hüseynovun bədii yaradıcılıq məharəti həm də ondadır ki, o, bədii qəhrəmanını bütün sadəliyi, sərbəst düşüncə sahibi olmasını, alim fərdiyyətinin üstünlüyünü yüksək məharətlə ifadə edib.

Pedaqogika üzrə elmlər doktoru Vaqif Qurbanov, professor Minaxanım Təkləli, professor Kamil Bəşirov, professor Nadir Abdullayev, dosent Ateş Abdullayev, dosent Məmmədxan Soltanov, baş müəllim İlham Abbasov və kafedranın digər əməkdaşları «Əzizxan» poemasının bədii xüsusiyyətləri haqqında çıxış ediblər.

Sonda kitabın müəllifi professor M.Hüseynov çıxış edərək universitet rəhbərliyinə, kafedranın əməkdaşlarına təqdimatın keçirilməsinə görə təşəkkür edib.

# "Erkən nikahlara yox!" mövzusunda sərgi



İyunun 21-də Yeni Azərbaycan Partiyasının Səbail rayon təşkilatının "Pedaqoqlar" ilk ərazi partiya təşkilatının Qadınlar Şurasının, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı fakültəsinin təşəbbüsü və təşkilatçılığı ilə universitetdə "Erkən nikahlara yox!" mövzusunda sərgi keçirilib. Tədbirdə İnzibati və iqtisadi işlər üzrə prorektor Ümid Mehdiyev, YAP-ın Səbail rayon təşkilatının "Pedaqoqlar" ilk ərazi partiya təşkilatının sədri, professor Himalay Qasımov, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov, həmin fakültənin dekan müavini, dosent Mətanət Əsgərova, İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov, Ümumi psixologiya kafedrasının müdiri, professor Ramiz Əliyev, Şimali Kipr Türk Respublikasından gəlmiş tanınmış rəssam Selvi Sertdemir, "Ümidli Gələcək" Gənclər İctimai Birliyinin icraçı direktoru Kəmalə Aşumova iştirak ediblər. Öncə sərginin rəmzi açılışını bildirən lent kəsilib.

Tədbiri giriş sözü ilə açan fakültənin dekanı, dosent Laçın Həsənova mövzunun aktuallığını qeyd edərək sözü Selvi Sertdemirə verib. Selvi Sertdemir öz fəaliyyəti barədə və erkən nikahların təhsilə, sağlamlığa mənfi təsirləri haqqında geniş danışıb. Qeyd edək ki, Selvi Sertdemir 1963-cü ildə Türkiyə Respublikasının Konya şəhərində anadan olub. Şimali Kipr Türk Respublikasının vətəndaşıdır. Həmin ölkədə SOS Uşaq Şəhərciyində işləyir. O, rəssam olmaqla yanaşı, "Uşaqların inkişafı" ixtisası üzrə mütəxəssisdir. Müxtəlif beynəlxalq sertifikatlara layiq görülüb. 2015-ci və 2016-cı illərdə İzmir Xəbər Agentliyinin "İlin ən yaxşı rəssamı" və SOS Uşaq Kəndinin "İlin ən yaxşı anası" mükafatları ilə təltif olunub. "Beynəlxalq Sosial Məsuliyyət ART" layihəsi çərçivəsində müxtəlif ölkələrdə "Erkən nikahlara yox!" mövzusunda çoxlu sərgilər keçirib.

YAP-ın Səbail rayon təşkilatının "Pedaqoqlar" ilk ərazi partiya təşkilatının sədri, professor H.Qasımov çıxışında fakültənin rəhbərliyinə, müəllim və tələbələrinə sərginin təşkil olunmasına görə təşəkkür edib. Qeyd edib ki, fakültə sosial fəallığına görə universitetdə seçilir. Professor H.Qasımov fakültənin əməkdaşlarına gələcək fəaliyyətlərində uğurlar arzulayıb.

Ümumi psixologiya kafedrasının müdiri, professor Ramiz Əliyev çıxışında sərginin mövzusunun və nümayiş olunan rəsm əsərlərinin maraqlı olduğunu bildirib və növbəti sərgilərin milli dəyərlərə, sağlam ailəyə həsr olunmasını təklif edib.

Sonra Əməkdar incəsənət xadimi Nailə Mirməmmədlinin rəhbərlik etdiyi fakültənin birləşmiş xoru fakültənin himnini, Nailə Mirməmmədlinin bəstələdiyi "Uşaqlar ağlamasın" mahnısını və turk bəstəsini ifa ediblər. Bədii hissədən somra iştirakçılar Selvi Sertdemir, Təsvir incəsənət və onun tədrisi metodikası kafedrasının müəllimi Bənövşə Ağayevanın, Vəfa Allahyarovanın və fakültə tələbələrinin rəsm əsərləri ilə tanış olublar.

Tədbirdə fakültənin fəal tələbələri diplomlarla təltif olunublar. Həmçinin Selvi Sertdemir fakültənin dekanı, dosent Laçın Həsənovaya, fakültənin müəllimləri Bənövşə Ağayevaya, Vəfa Allahyarovaya və tələbələrinə diplomlar təqdim edib.

**Nurlan Səmədov,**
**Orxan Abdullayev**

# Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyinə həsr olunmuş tədbir



İyunun 1-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı fakültəsində Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyinə həsr olunmuş tədbir keçirilib. Tədbirdə fakültənin professor-müəllim heyəti, tələbələri və Azərbaycan Xalq Cümhuriyyətinin yaradıcısı Məhəmməd Əmin Rəsulzadənini nəvəsi, Təsviri incəsənət və onun tədrisi metodikası kafedrasının dosenti Rais Rəsulzadə iştirak ediblər.

Tədbirdə "Musiqi müəllimliyi" ixtisası üzrə təhsil alan tələbələrin böyük konsert proqramı keçirilib. Konsertdə tar, kamança, fortepiano, ansambllar, xor nömrələri tələbələrin ifalarında səslənib. III tədris ili tələbələrindən Leyla Həsənli, Etibar İsmayılov, Məhəmməd Səmədov, Nəsrin Əlizadə (müəllim Adil Vəliyev), Aydan Quluzadə (müəllim professor Zemfira Abdullayeva), Məhərrəməli Əlişanov (müəllim Ramiz Əliyev), II tədris ili tələbələrindən Könül Məmmədova (müəllim Gularə Aslanova), Səkinə Məhərrəmova (müəllim dosent Aida Hüseynova), Gülsənəm Şahbazova (müəllim professor Minara Dadaşova) və başqalarının çıxışları dinləyicilər tərəfindən rəğbətlə qarşılanıb.

Tədbirin sonunda fakültənin dekanı, dosent Laçın Həsənova və dosent Rais Rəsulzadə çıxış edərək tələbələrə və müəllimlərə minnətdarlıqlarını bildiriblər.

# ADPU-nun əməkdaşları "Azərbaycan Universitetləri Tanıtımı - 2" sərgisində iştirak ediblər

İyun 23-də Hədəf Kursları və Hədəf Globalın təşkilatçılığı ilə "Azərbaycan Universitetləri Tanıtımı - 2" sərgisi keçirilib. Azərbaycanın elmi-mədəni həyatında mühüm hadisə kimi qiymətləndirilən bu sərgidə 15-ə yaxın universitet təmsil olunub. Sərgidə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) əməkdaşları - Tədris Departamentinin Məzun, Koordinasiya və Karyera bölməsinin müdiri Könül Əsgərova, İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin müdir müavini Orxan Abdullayev və Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin II tədris ilinin 209-cu qrup tələbəsi İlahə Qurbanova iştirak ediblər.





Qeyd edək ki, ADPU-nun sərgidə təqdim etdiyi müxtəlif çap məhsulları iştirakçıların marağına səbəb olub.

**Orxan Fəxrəddinoğlu**

# ADPU-nun Quba Filialında 26 İyun - Azərbaycan Respublikası Silahlı Qüvvələri Gününə həsr edilmiş tədbir



İyunun 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialında 26 İyun-Azərbaycan Respublikası Silahlı Qüvvələri Gününə həsr edilmiş tədbir keçirilib. Tədbirdə filialın tədris və elmi işlər üzrə direktor müavini, tarix üzrə fəlsəfə doktoru İsmayıl Mahmudov, tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva, müəllim və tələbə kollektivi iştirak edib.

Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlayıb. Tədbirdə filialın rbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva, Pedaqoji və ictimai fənlər kafedrasının baş müəllimi Novruz Kərimov, filialın Tələbə Gənclər Təşkilatının (TGT) sədri Həcər Seyidəhmədova, TGT-nın sədr müavini Murad Şərifov çıxış edib, bu il Azərbaycan Silahlı Qüvvələrinin yaranmasının 100 illiyindən, bu məqsədlə keçirilən tədbirlərdən, müasir dövrdə Milli Ordumuzun hərbi güc və qüdrətindən, müstəqil Azərbaycan Respublikasında ordu quruculuğuna göstərilən diqqət və qayğıdan ətraflı bəhs ediblər.

Sonda "Qüdrətli Azərbaycan Ordusu" adlı videoçarx nümayiş olunub.

# Prezident İlham Əliyevin Azərbaycan Xalq Cümhuriyyəti dövrü ədəbiyyatının təbliği və inkişafında rolu

**Azərbaycan xalqının etimadı əsasında ölkəyə rəhbərlik edən Prezident İlham Əliyev ümummilli lider Heydər Əliyevin siyasi kursunu şaxələndirərək, uğurla reallaşdırması nəticəsində perspektiv baxımdan əhəmiyyətli nəticələrin əldə olunmasına səbəbkar olub. Məhz Prezident İlham Əliyevin son illər ərzində həyata keçirdiyi sosial-iqtisadi və siyasi islahatlar müasir Azərbaycanın müstəqilliyini daha da möhkəmləndirib, regional gücünü və qlobal əhəmiyyətini artırıb. Təkzibolunmaz faktdır ki, Azərbaycan hakimiyyətinin siyasəti birbaşa olaraq, vətəndaşların sosial rifah halının yüksəldilməsinə, onların yüksək səviyyəli həyat şəraitilə əhatələnməsinə, həmçinin mükəmməl təhsil almasına, sağlam, vətənpərvər yetişməsinə, hüquq və azadlıqlarının müdafiə edilməsinə istiqamətlənib.**

Prezident İlham Əliyev gənc nəslin intellektual, kreativ, vətənpərvər və sağlam yetişməsi üçün insan kapitalının formalaşdırılması siyasətinə xüsusi diqqət ayırır. Çünki ölkə Prezidenti humanizm və insani dəyərləri idarəçiliyin əsas meyarına çevirməyi, Azərbaycanda əsl rifah dövləti yaratmağı hədəfləyib.

Şəxsiyyətində cəmlənən yüksək intellekt, fəal işgüzarlıq, hər kəsə xas olmayan təvazökarlıq, dərin savad, səmimiyyət, mütərəqqi idarəçilik prinsiplərinə yiyələnməsi bir Lider kimi onu cəmiyyətdə böyük nüfuz sahibinə çevirdi.

Bütün bu keyfiyyətlər İlham Əliyevi həm də böyük Azərbaycan ədəbiyyatınn təəssübkeşinə çevirdi. Azərbaycan Respublikasının Prezidenti seçildiyi ilk gündən İlham Əliyev mədəniyyətin, ədəbiyyatın inkişafına böyük diqqət və qayğı göstərmiş, bu sahənin inkişafını dövlət siyasətinin prioritetlərindən biri elan etmişdir.

Hər bir xalqın mədəniyyəti, ədəbiyyatı onun böyüklüyünün, müdrikliyinin, birliyinin təcəssümüdür. Azərbaycan xalqı qədim tarixə və mədəniyyətə, ədəbiyyata malik bir xalq kimi artıq bütün dünyada tanınmışdır. Azərbaycan mədəniyyətinin, ədəbiyyatının yaranması və mənəvi rolunun yüksək dəyərləndirilməsində tarix boyu bir çox şəxsiyyətlərin bəhrəsi olmuşdur ki, yeni dövrün də belə bir nəhəng şəxsiyyətlərindən biri ulu öndər məhz Heydər Əliyev, bir də onun davamçısı İlham Əliyevdir.

Son onilliklərdə Azərbaycan mədəniyyətinin, ədəbiyyatının hərtərəfli inkişafında və onun zəngin mənəvi-mədəni irsinin dünya mədəni aləminə çatdırılmasında İlham Əliyev çox böyük rol oynamış və bu fəaliyyət respublikanın gələcək mənəvi-siyasi həyatı üçün örnək və irsə münasibətdə siyasətin konsepsiyasının yaranması baxımından mühüm əhəmiyyətə malikdir.

Həm dövlətin başçısı, həm də vətənpərvər bir insan kimi İlham Əliyevin milli mədəniyyətə, ədəbiyyata, mənəvi irsə göstərdiyi hörmət, verdiyi dəyər onun toxunduğu hər bir sahədə özünü göstərməkdədir.

Prezidentin Azərbaycanın mədəniyyət, incəsənət, ədəbiyyat xadimləri ilə görüşləri, söhbətləri, mədəniyyət məsələləri ilə bağlı nitqləri, çıxışları, müsahibələri, təbrikləri, bu sahəyə dair rəsmi materiallar, habelə qanun, fərman və sərəncamları Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin uzun illər ərzində ədəbi-mədəni irsimizə, mənəvi dəyərlərimizə bağlılığını, hörmətini və sonsuz qayğısının ifadəsidir.

Bu qayğı və ifadə Azərbaycan Xalq Cümhuriyyəti dövründə yaranmış mədəniyyət və ədəbiyyata münasibətdə də özünün böyük təzahürünü tapdı. Belə ki, Prezident İlham Əliyevin Azərbaycan Xalq Cümhuriyyətinin 100 illiyi ilə bağlı 16 may 2017-ci il tarixində imzaladığı Sərəncam Cümhuriyyət irsinə, ideyalarına, ədəbiyyat və mədəniyyətinə verilən yüksək dəyərdir. Sərəncamın bir məqamında o dövrün ədəbiyyat və mədəniyyətinə, onun nümayəndələrinə dürüst və möhtəşəm qiymət verilir: "Azərbaycan Xalq Cümhuriyyəti məhz dünyanın siyasi nizamının yenidən qurulduğu bir vaxtda, XIX əsrin axırları və XX əsrin əvvəllərində Azərbaycanın yaşadığı parlaq mədəni yüksəliş mərhələsinin məntiqi yekunu kimi meydana çıxmışdır.

XIX əsrin birinci yarısından etibarən maarifçilik ideyalarının yayılması ilə Azərbaycanda baş vermiş köklü ictimai-siyasi və mədəni dəyişikliklər yeni tipli teatrın, məktəbin və mətbuatın yaranmasını təmin etməklə milli özünüdərkin gerçəkləşməsi üçün zəmin hazırladı. Abbasqulu ağa Bakıxanov və Mirzə Fətəli Axundzadə ilə başlayan bu yolu yeni tarixi mərhələdə Həsən bəy Zərdabi, Cəlil Məmmədquluzadə, Mirzə Ələkbər Sabir, Əli bəy Hüseynzadə və digər görkəmli şəxsiyyətlər davam etdirərək milli məfkurənin təşəkkülü və inkişafına mühüm təsir göstərirdilər".

İlham Əliyev Heydər Əliyev ənənələrini davam etdirərək həmişə Cümhuriyyət dövrünün yaradıcı ziyalılarına yüksək qiymət vermişdir. Bu mənada dövlət başçımızın Azərbaycan Cümhuriyyəti dövründə fəaliyyət göstərən ədəbiyyat və incəsənət xadimlərinə münasibəti diqqətə layiqdir. Yazıçı və şairlərin mədəni irsinə qayğı, onların kitablarının nəşri, ayrı-ayrı incəsənət xadimlərinin yubileylərinin keçirilməsi olduqca təqdirəlayiq işdir və bütün bunlar dövlət səviyyəsində aparılır.

Sərəncamda deyilir: "...milli tələblərə və demokratik prinsiplərə uyğun dövlət orqanları quruldu, maarifin və mədəniyyətin inkişafına xüsusi diqqət yetirildi, Azərbaycanın ilk universiteti təsis olundu, təhsil milliləşdirildi, xalqın sonrakı illərdə mədəni yüksəlişi üçün zəmin hazırlayan, ictimai fikir tarixi baxımından müstəsna əhəmiyyətli işlər görüldü."

Ümummilli lider Heydər Əliyevin respublikada uğurla gerçəkləşdirdiyi siyasət xalqımızın tarixi-mədəni yaddaşını özünə qaytararaq milli mənlik şüurunu inkişaf etdirdi, azərbaycançılıq məfkurəsi işığında müstəqillik arzularının güclənməsi və yaxın gələcəkdə yenidən həqiqətə çevrilməsinə zəmin yaratdı.

1991-ci ildə müstəqilliyinin bərpasına nail olarkən müasir Azərbaycan Respublikası özünün qədim dövlətçilik ənənələrinə sadiq qaldığını göstərdi, Xalq Cümhuriyyətinin siyasi və mənəvi varisi olmaqla onun üçrəngli bayrağını, gerbini, himnini qəbul etdi. Bu himnin müəllifləri Azərbaycan mədəniyyətinin və ədəbiyyatının korifeyləri olan Əhməd Cavad Və Üzeyir Hacıbəyli idi.

Tarixdən məlumdur ki, xalqımızın maarifpərvər ziyalıları, dövrün siyasi xadimləri, yazıçı və şairləri daim milli kimliyimizin, dövlətçilik ənənələrimizin qorunması və gələcək nəsillərə ötürülməsi istiqamətində gərgin mübarizə aparıblar. Bu mübarizənin nəticəsi olaraq 1918-ci ilin 28 mayında elan olunan Azərbaycan Xalq Cumhuriyyəti tarixin ən çətin dövründə üzərinə götürdüyü şərəfli missiyanı uğurla yerinə yetirib. Ana dili dövlət dili elan olundu. Maarifin və mədəniyyətin inkişafına xüsusi diqqət yetirildi, Azərbaycanın ilk müasir universiteti təsis olundu, təhsil milliləşdirildi, tarixi adlar bərpa edildi.

O da məlumdur ki, Azərbaycanın bolşevik işğalı nəticəsində endirilmiş və bir də 1990-cı ildə istiqlal mübarizəsi meydanlarında görünən üçrəngli bayrağı yalnız ulu öndər Heydər Əliyevin Vətən təəssübkeşliyi və sevgisi sayəsində yenidən dövlət bayrağı kimi dalğalanmağa başladı. Azərbaycan Xalq Cümhuriyyətinin üçrəngli bayrağı ilk dəfə müstəqil Azərbaycan Respublikasının bayrağı oldu.

Prezident İlham Əliyev Azərbaycan Xalq Cümhuriyyəti tarixinin, ədəbiyyatının, mədəniyyətinin araşdırılmasının vacibliyini istər çıxış və nitqlərində, istərsə də verdiyi müvafiq sərəncamlarında dəfələrlə xüsusi olaraq vurğulayıb. Prezidentimizin Azərbaycan Xalq Cümhuriyyətinin 90 və 100 illik yubileyləri haqqında verdiyi məlum sərəncamları ilə bərabər, Azərbaycan Xalq Cümhuriyyətinin tariximizdə tutduğu yerə və liderlərinə verdiyi böyük qiymətin bariz nümunələrindən biri də Bakıda "İstiqlal Bəyannaməsi" abidəsinin ucaldılması, Azərbaycanın üçrəngli bayrağının şərəfinə Dövlət Bayraq Meydanının inşası və bu meydanda dalğalanan bayrağımızın dünyanın ən uca bayrağı olmasıdır! Unudulmaz klassikimiz Cəfər Cabbarlı Cümhuriyyət dövründə yazdığı "Azərbaycan bayrağına" şeirində üçrəngli Azərbaycan bayrağının rəmzlərini bədii şəkildə əks etdirir, üçrəngli bayrağa, Vətənə müqəddəs hisslərlə yanaşır, bu bayraqda türkçülük, turançılıq ideyalarını ümumiləşdirir:

*Bu göy boya Göy Moğoldan qalmış*
*Bir türk nişanı,*
*Bir türk oğlu olmalı!*
*Yaşıl boya İslamlığın sarsılmayan imanı,*
*Ürəklərə dolmalı!*
*Şu al boya azadlığın, təcəddüdün fərmanı,*
*Mədəniyyət bulmalı!*
*Səkkiz uclu şu yıldız da səkkiz hərfi od yurdu,*
*Əsarətin gecəsindən fürsət bulmuş quş kibi*
*Səhərlərə uçmuşdur.*

Bir faktı da xatırladım ki, 1918-ci ildə Xalq Cümhuriyyəti elan olunanda Azərbaycanda 2 milyon 900 min insan yaşayırdı. Onlardan sadəcə 76 nəfərinin yüksək ali təhsili var idi. Bu insanlar qısa müddətdə Azərbaycanda demokratik dövlət qura bildilər. Azərbaycan Xalq Cümhuriyyətinin yaranması ilə bizdə dövlət təsisatlarının yaranmasının əsası qoyuldu. Ona görə də Azərbaycan Xalq Cümhuriyyətinin mövcud olduğu dövr bizim tariximizin ən şərəfli hissəsini təşkil edir. Bu şərəfli tarixin yaradıcıları sırasında ən öndə gedənlər ədəbiyyat adamları, ədəbiyyat fədailəri idilər.

1918-1920-ci illərdə Məhəmməd Əmin Rəsulzadə, Firudin bəy Köçərli, Cəlil Məmmədquluzadə, Üzeyir Hacıbəyli, onun qardaşı Ceyhun Hacıbəyli, Əbdürrəhim bəy Haqverdiyev, Əlimərdan bəy Topçubaşov, Əhməd Ağaoğlu, Məhəmməd Hadi, Hüseyn Cavid, Abdulla Şaiq, Yusif Vəzir Çəmənzəminli, Məmməd Səid Ordubadi, Əliqulu Qəmküsar, Cəfər Cabbarlı, Əhməd Cavad, Almas İldırım, Ümgülsüm Sadıqzadə, Əli Yusif, Əli Şövqü, Davud Ağamirzadə, Seyid Hüseyn, Tağı Şahbazi kimi tanınmış ədiblər müstəqillik dövrü ədəbiyyatı sahəsində uğurlar qazandılar, ədəbiyyatda Xalq Cümhuriyyətinin yaşadığı dövrün ümumi mənzərəsini əks etdirirdilər.

Maraqlı bir faktı da xatırladım: Cümhuriyyət dövründə Seyid Hüseyn "Yaşıl qələm" ədəbi-elmi cəmiyyət yaradır. Bu cəmiyyət Məhəmməd Əmin Rəsulzadə, Hüseyn Cavid, Seyid Hüseyn, Nəcəf bəy Vəzirov, Üzeyir Hacıbəyli, Abdulla Şaiq, Əhməd Cavad, Cəfər Cabbarlı, Salman Mümtaz, Əli Yusif və digər ziyalıları, sənətkarları özündə birləşdirirdi.

Burada adlarını çəkdiyimiz, xatırladığımız ədiblərin böyük əksəriyyətinin şəxsiyyətinə, yaradıcılığına, əsərlərinin nəşrinə, yubileylərinin keçirilməsinə, adlarının əbədiləşdirilməsinə Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin müstəsna qayğısı, məhəbbəti böyük qürur hissi doğurur.

Ölkə Prezidentinin ədəbiyyata və mədəniyyətə göstərdiyi diqqət və qayğının bariz nümunəsi kimi Onun bir sıra sərəncamlarına nəzər salmaq və bu sərəncamlardan irəli gələn işlərin həyata keçirilməsinin bir neçə nümunələrini xatırlatmaq istərdim. Məsələn, mühacirət həyatı yaşamış, repressiyaya uğramış görkəmli Azərbaycan şairi Almas İldırımın 100 illik yubileyinin keçirilməsi barədə Prezidentin 16 aprel 2007-ci il tarixli Sərəncamı da ədəbiyyata diqqət və qayğı baxımından dəyərlidir. Almas İldırımın şəxsiyyəti və yaradıcılığı həmin Sərəncamda belə səciyyələndirilir: "Almas İldırımın yaradıcılığı Azərbaycan mühacirət poeziyasının bənzərsiz səhifələrindən birini təşkil edir. Şairin milli azadlıq və müstəqillik uğrunda mübarizəyə həsr olunmuş əsərlərində xalqımızın ağrılı tarixi taleyi, vətən məhəbbəti və qəriblik mövzusu dolğun bədii əksini tapmışdır".

XX əsr Azərbaycan ədəbiyyatının dahilərindən biri olan Hüseyn Cavidin 125 illik yubileyinin keçirilməsi haqqında Prezident İlham Əliyevin 17 aprel 2007-ci il tarixdə imzaladığı Sərəncamın da məzmunu bu cəhətdən olduqca səciyyəvidir və Hüseyn Cavid irsinin öyrənilməsi istiqamətində Heydər Əliyev kursunun, ənənələrinin ləyaqətli davamıdır.

Belə əhəmiyyətli sərəncamlardan biri də, "Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi" haqqında Azərbaycan Respublikası Prezidentinin 12 yanvar 2004-cü ildə imzaladığı Sərəncamdır.

Məlumdur ki, müstəqil Azərbaycan Respublikasında həyatın müxtəlif sahələrində aparılan islahatlar arasında Azərbaycan Xalq Cümhuriyyətindən yadigar qalan latın qrafikalı Azərbaycan əlifbasının bərpa edilməsi böyük tarixi əhəmiyyət kəsb edir. Ulu öndər Heydər Əliyevin "Dövlət dilinin tətbiqi işinin təkmilləşdirilməsi haqqında" 18 iyun 2001-ci il tarixli və "Azərbaycan əlifbası və Azərbaycan dili gününün qeyd edilməsi haqqında" 9 avqust 2001-ci il tarixli fərmanları ölkənin ictimai-siyasi həyatında mühüm hadisə olmuş və latın qrafikalı Azərbaycan əlifbasına keçidi bütövlükdə təmin etmişdir. Beləliklə, latın qrafikalı Azərbaycan əlifbası artıq həyatımızın, təhsilimizin, mətbuatımızın bütün sahələrində tam yerini tutmuşdur. Bununla yanaşı, Azərbaycan ədəbiyyatı, mədəniyyəti və elminin vaxtilə kiril qrafikası ilə çap olunmuş qiymətli nümunələrinin latın qrafikasında yenidən kütləvi şəkildə nəşr olunması günün ən vacib məsələlərindən biri olaraq qalırdı. Kiril əlifbasını bilməyən gənc nəsil klassik ədəbiyyatımızın nümunələrini, dünya ədəbiyyatının incilərini, folklor ədəbiyyatını oxumaq imkanlarından məhrum idi. Bu boşluğu doldurmağa mühüm ehtiyac günün ən vacib məsələlərindən idi.

Beləliklə, ana dilinə dövlət qayğısının daha da artırılmasını təmin etmək, Azərbaycan ədəbiyyatı, mədəniyyəti və elminin ən gözəl nümunələrini müasir dövrdə təbliğ etmək və gələcək nəsillərə çatdırmaq məqsədilə Azərbaycan dilində əvvəllər kiril qrafikasında çap olunmuş əsərlərin latın qrafikası ilə yenidən nəşrinin kütləvi şəkildə həyata keçirilməsi zərurətə çevrilmişdi. Bu nəşrlərin sırasında ən mühüm yer tutan Cümhuriyyət dövrü ədəbiyyatının klassiklərinin əsərləridir.

Bütün bunları nəzərə alan Prezident İlham Əliyev həmin Sərəncamı verməklə yeni nəsil azərbaycanlılara böyük bir mənəvi-ədəbi sərvət bəxş etmiş oldu.

XX əsrin əvvəllərində yaşayıb-yaratmış M.Ə.Sabirin, Ə.Hüseynzadənin, H.Cavidin, Ü.Hacıbəylinin, M.Ə.Rəsulzadənin, Ə.Cavadın, C. Cabbarlının, A.İldırımın, A.Şaiqin və digər bu sıradan olan ədiblərimizin yubileylərin keçirilməsi barəsində verilən sərəncamlar və həmin sərəncamlardan irəli gələn möhtəşəm yubiley tədbirlərinin keçirilməsi xalqımız və ədəbi ictimaiyyətin xoşluqla xatırladıqları ədəbiyyat hadisələridir.

Məhəmməd Əmin Rəsulzadənin 130 illik yubileyinin keçirilməsi haqqında Prezident İlham Əliyevin 2013-cü il 22 noyabr tarixli sərəncamı bu cəhətdən xüsusilə qiymətlidir və Azərbaycan Cümhuriyyətinin memarına böyük və əvəzsiz bir münasibətdir. Bu sərəncamın ən əhəmiyyətli cəhətlərindən biri də budur ki, M.Ə.Rəsulzadə başda olmaqla Əlimərdan bəy Topçubaşov, Fətəli xan Xoyski, Nəsib bəy Yusifbəyli, Həsən bəy Ağayev, Məmməd Yusif Cəfərov, Xəlil bəy Xasməmmədov kimi bizim o zamankı milli mücahidlərimizin həyat və fəaliyyətləri də bu yubiley münasibətilə xatırlandı, tədqiq və təbliğ edildi.

Sərəncamda Məhəmməd Əmin Rəsulzadə xalqımızın müstəqillik idealının gerçəkləşdirilməsində, Azərbaycanın tarixi dövlətçilik ənənələri zəminində milli dövlət quruluşunun dirçəldilməsində, milli istiqlal ideyalarının geniş yayılmasında böyük xidmətlər göstərmiş və siyasi publisistikası ilə ədəbi-ictimai fikir tariximizə layiqli töhfələr vermiş görkəmli ictimai-siyasi xadim kimi qiymətləndirilmişdir.

Yeri gəlmişkən, ümummilli lider Heydər Əliyevin müvafiq sərəncamına uyğun olaraq 1994-cü ildə M.Ə.Rəsulzadənin 110 illik yubileyi geniş qeyd edilmişdir. Həmçinin Azərbaycan Xalq Cümhuriyyətinin 80 illik yubileyində Ulu Öndər nitqində Şərqdə ilk demokratik respublikanın yaradıcılarının vətəndaşlıq şücaəti, xalq qarşısında böyük qəhrəmanlıq nümunələri göstərdiklərini xüsusi vurğulamışdır.

Həmin sərəncamlar Prezident İlham Əliyevin bütün dövr ədəbiyyat tarixini diqqətdə saxlamasını xüsusən nəzərə çatdırır. Bunlar bir də ona görə olduqca əhəmiyyətlidir ki, Prezident İlham Əliyev ən böyük vətənpərvər kimi imzaladığı sərəncamlarla Azərbaycan mədəniyyətinin, ədəbiyyatının, bununla da Azərbaycan xalqının kimliyini dünyanın gözləri qarşısında canlandırır.

Bu sərəncamlar həm də onu deməyə əsas verir ki, Prezident İlham Əliyev Azərbaycan mədəniyyəti və ədəbiyyatının milli-mənəvi həyatımızdakı yerini və rolunu olduqca dərindən bilir və onu yüksək dərəcədə qiymətləndirir, Azərbaycan tarixinə, mədəniyyətinə, ədəbiyyatına böyük hörmət və məhəbbət bəsləyir.

Bu sərəncamları belə sıralamaqda məqsədimiz cənab İlham Əliyevin bütün dövr ədəbiyyat tarixinin diqqətdə saxlamasını xüsusən nəzərə çatdırmaqdır.

Başqa bir nümunəyə nəzər salaq. Ölkə Prezidenti İlham Əliyev çıxışlarının birində Azərbaycan ədəbiyyatı və mədəniyyətinə münasibətini belə ifadə etmişdir: "Azərbaycan, Azərbaycan xalqı uzun illər, onilliklər, əsrlər boyu müstəmləkə vəziyyətində yaşamışdır. Müstəqil respublika kimi də yaşamışdır. Azərbaycan xalqının, bizim hamımızın milli xüsusiyyətlərini qoruyub saxlamaq üçün ədəbiyyatımızın, mədəniyyətimizin böyük rolu olmuşdur. Əgər bunlar olmasaydı, əgər Azərbaycan xalqı öz tarixi köklərinə bağlı olmasaydı, bizim bugünkü taleyimiz başqa cür olardı. Məhz Azərbaycanın zəngin tarixi, mədəniyyəti, ədəbiyyatı, Azırbaycan dili bizi - Azərbaycan xalqının nümayəndələrini bu gün də öz keçmişimizə hörmətlə yanaşmağa imkan verir. Azərbaycan tarixində müstəsna xidmətləri olmuş şəxslərin xatirəsinə həmişə hörmətlə yanaşmalıyıq, onları həmişə ehtiramla yad etməliyik. Biz heç vaxt öz milli xüsusiyyətlərimizi unutmamalıyıq, öz keçmişimizi unutmamalıyıq. Keçmişimizin və bu günümüzün gözəl nümunələrini təbliğ etməliyik, dünyaya yaymalıyıq..."

Bu müqəddəs iş cənab İlham Əliyevin rəhbərliyi və tövsiyələri əsasında uğurla davam etdirilir və Azərbaycan ədəbiyyatının klassiklərini dünyada tanıtdırır...

Son olaraq Məhəmməd Hadinin aşağıdakı misralarını Cümhuriyyət dövrü ədiblərimizin ruhlarına bir söz çələngi kimi ərməğan edirəm:

*Sizin məzarınız iştə qülubi-millətdir,*
*Bu sözlərim ürəyimdən gələn həqiqətdir.*
*Sizi unutmayacaq şanlı millətim əsla,*
*Əmin olun buna, ey ziynəti-cahani fəna.*
*Sizinlə buldu bu millət həyati - püriqbal.*
*Sizinlə buldu bu millət şərəfli istiqlal.*

**Tərlan Novruzov,**
**professor, Əməkdar müəllim**

# Azərbaycan Xalq Cümhuriyyəti və təhsil

Azərbaycan Xalq Cümhuriyyətinin çoxsahəli fəaliyyətinə ən yüksək qiyməti ümummilli liderimiz Heydər Əliyev vermişdir. Cümhuriyyətin fəaliyyətini qiymətləndirərək ulu öndər Heydər Əliyev qeyd etmişdir: "Azərbaycan Xalq Cümhuriyyəti gərgin və mürəkkəb ictimai-siyasi şəraitdə cəmi 23 ay fəaliyyət göstərsə də, sonrakı nəsillərin yaddaşında xalqımızın tarixinin ən parlaq səhifələrindən biri kimi həmişə qalacaqdır. O, demokratik dövlət quruculuğu, iqtisadiyyat, mədəniyyət, təhsil, səhiyyə, hərbi quruculuq sahələrində atdığı mühüm addımları başa çatdıra bilməsə də, onun qısa müddətdə həyata keçirdiyi tədbirlər xalqımızın tarixində silinməz iz buraxmış, milli dövlətçilik ənənələrimizin bərpası işində böyük rol oynamışdır. Ən əsası odur ki, Azərbaycan Xalq Cümhuriyyəti az yaşasa da, xalqımızda azadlıq, müstəqillik fikirlərini daha da gücləndirmiş oldu".

1998-ci il yanvar ayının 30-da Heydər Əliyev "Azərbaycan Xalq Cümhuriyyətinin 80 illiyinin keçirilməsi haqqında" Sərəncam imzalamış və bu yubiley dövlət səviyyəsində keçirilmişdir. Ümummilli Liderin qeyd etdiyi kimi, əgər XX əsrin əvvəllərində xalqımız milli azadlıq, dövlət müstəqilliyi yolunda ilk dəfə böyük addım atıbsa, XX əsrin sonunda milli azadlığa, dövlət müstəqilliyinə tam nail olubdur. "Müsəlman Şərqində ilk demokratik cümhuriyyətin məhz Azərbaycan torpağında yaranması xalqımızın o dövrdə və o illər ərəfəsində - XIX əsrin sonunda və XX əsrin əvvəllərində milli müstəqillik və azadlıq duyğuları ilə yaşaması ilə bağlıdır. O illərdə xalqıımızın qabaqcıl şəxsiyyətləri, mütəfəkkir adamları, ziyalıları xalqımızda milli azadlıq, milli müstəqillik duyğularını gücləndirmiş, milli dirçəliş, milli oyanış əhvali-ruhiyyəsini yaymış və bunların hamısı məntiqi olaraq Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasına gətirib çıxarmışdır".

Ulu Öndərin layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev 15 fevral 2008-ci il tarixdə "Azərbaycan Xalq Cümhuriyyətinin 90 illik yubileyinin keçirilməsi haqqında" Sərəncam imzaladı. Azərbaycan Respublikası Milli Məclisi də Xalq Cümhuriyyəti parlamentinin 90 il□lik yubileyinə həsr olunmuş xüsusi tədbir keçirdi.

Prezident İlham Əliyev 2013-cü il may ayının 27-də "Buta" sarayında Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 95 illiyi ilə bağlı keçirilən rəsmi qəbulda bildirmişdi: "Doxsan beş il əvvəl müsəlman aləmində ilk dəfə olaraq Azərbaycanda demokratik respublika yaranmışdır. Bu, böyük və tarixi hadisə idi. Çünki Azərbaycan xalqı əsrlər boyu arzuladığı müstəqilliyə, azadlığa qovuşurdu. Azərbaycan xalqının artıq öz dövləti var idi. Eyni zamanda, respublikanın yaranması müsəlman aləmində respublika quruluşunun yayılmasına da təkan vermişdi. Qısa müddət ərzində bütün dövlət qurumları, dövlət təsisatları yaradılmışdı. Demokratik inkişaf gedirdi, qadınlara səsvermə hüququ verilmişdi, Milli Ordu yaradılmışdı. Bir sözlə, respublikanın qurucuları böyük işlər görmüşdülər və Azərbaycan xalqı onların xatirəsinə böyük hörmətlə yanaşır. "İstiqlal Bəyannaməsi"ni imzalayanların şərəfinə Bakının mərkəzində abi□də ucaldılmışdır".

2018-ci il yanvar ayının 10-da dövlət başçımız İlham Əliyev Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 100 illiyi haqqında Sərəncam imzalamış və 2018-ci ili "Azərbaycan Xalq Cümhuriyyəti İli" elan etmişdir.

1918-ci ilin yazında - may ayında heç bir qüvvəsi və hakimiyyəti olmayan Zaqafqaziya Seymi dağıldı, meydana gəlmiş konkret tarixi şəraitdə 1918-ci il mayın 27-də Seymdə olan Azərbaycan nümayəndələri Azərbaycanın istiqlalını elan etmək qərarına gəldilər. Beləliklə, təqribən bir əsrlik fasilədən sonra bu qədim türk diyarında müstəqil dövlət quruluşu bərpa olundu.

Bu haqda Məhəmməd Əmin Rəsulzadə yazırdı: "Türk mənşəli bütün başqa dövlətlər meydana gələrkən, xüsusən, dini əsasa söykənmişdirsə, Azərbaycan Respublikası türk milli demokratik dövlətçiliyi zəminində milli-mədəni təyini-müqəddəratın müasir özülünə əsaslanmışdır. Bu nöqteyi-nəzərdən bizim respublikamız birinci türk dövlətidir".

Həmin il mayın 30-da Tiflisdə ilk respublikanın ilk hökuməti - Fətəli xan Xoyskinin başçılığı altında kabinet təşkil edildi, ilk gündən başlayaraq Azərbaycan hökuməti geniş tədbirlər həyata keçirməyə başlamışdı.

Yaxın və Orta Şərqdə ilk demokratik dövlət qurumu olan Azərbaycan Xalq Cümhuriyyətinin fəaliyyətində olan müsbət cəhətlərin, o cümlədən xalq maarifi sahəsindəki misilsiz təşəbbüslərin üzərindən Sovetlər dövründə uzun müddət sükutla keçmişdir. Bu gün aradan yüz il keçəndən sonra, xüsusilə, aydın görünür ki, demokratik hökumətin bu sahədəki fəaliyyəti, həqiqətən, öz bəşəri, humanist məzmunu ilə seçilir.

Azərbaycan hökumətinin siyasətində mədəni-maarif islahatlarından danışarkən, ilk növbədə, Azərbaycan dilinin dövlət dili elan edilməsi, Bakı Dövlət Universitetinin təşkili, milli kadrlar yetişdirməyə yönəldilmiş tədbirlər, ana dilində məktəblərin açılması, azərbaycanlı tələbələrin ali təhsil almaq üçün Avropa ölkələrinə göndərilməsi və sair tədbirlər qeyd edilməlidir. Demokratik hökumətin 30 iyun 1918-ci il tarixli qərarına əsasən, Gəncədə Xalq Maarif Nazirliyinin dəftərxanası təşkil edilmiş və onun kadrlarla təmin edilməsi sahəsində tədbirlər görülmüşdür.

Xalq Maarif Nazirliyi bütün tədris müəssisələri haqqında məlumat toplamağa başlamışdı. Bu tədbirin həyata keçirilməsində əsas məqsəd maarif sahəsində islahatlar keçirmək idi.

Azərbaycan Xalq Cümhuriyyəti Hökumətinin xalq maarifinin inkişafına çox mühüm təkan verən ilk tədbirlərindən biri 27 iyun 1918-ci il tarixli qərar oldu. Həmin qərara əsasən, Azərbaycan-türk dili dövlət dili elan edildi. Lakin Azərbaycan dilini mükəmməl bilən ixtisaslı kadrların olmaması qərarın həyata keçirilməsini çətinləşdirirdi. Buna görə də inzibati idarə orqanları, məhkəmə işi və s. sahələrdə Azərbaycan dilini bilən ixtisaslı kadrlar hazırlanana qədər, müvəqqəti olaraq, rus dilindən istifadəyə də yol verilirdi. Cümhuriyyət Hökuməti milli kadrların yetişdirilməsinə, bu sahədə təhsilin tamamilə yenidən qurulmasına xüsusi əhəmiyyət verirdi. Təhsil sahəsində həyata keçirilən ilk mühüm tədbir məktəblərin milliləşdirilməsi oldu. Azərbaycan Hökumətinin 28 avqust 1918-ci il tarixli qərarında göstərilirdi ki, bütün ibtidai tədris müəssisələrində təhsil şagirdlərin öz ana dilində aparılmalı və dövlət dili olan Azərbaycan dilinin tədrisi icbari surətdə həyata keçirilməlidir. Azərbaycan dilini bilməyən şagirdlər üçün üçüncü və dördüncü siniflərdə rus şöbələri açılır və burada Azərbaycan dili intensiv surətdə tədris olunurdu ki, 2 ildən sonra həmin şagirdlər artıq Azərbaycan dilində təhsillərini davam etdirə bilsinlər. 5-ci sinifdən sonra şagirdlər məktəbi qurtarana qədər tədris prosesi rus dilində aparılır, Azərbaycan dili isə həmin siniflərdə məcburi fənn kimi tədris olunurdu. Bu siniflərdə Azərbaycan dilinin tədrisi həftədə 4 saatdan az olmamalı idi.

Maarif sisteminin milliləşdirilməsi sahəsində ən böyük çətinlik müəllim kadrların çatışmaması ilə bağlı idi. Müəllimlərə olan ehtiyacı ödəmək üçün 1918-ci ildə Gəncə, Şəki və Zaqatalada qısamüddətli pedaqoji kurslar təşkil edildi və bu kurslarda 150 nəfər oxumağa başladı. Həmin dövlətdə Gəncədə fəaliyyət göstərən müəllim seminariyası kadrlara olan ehtiyacı ödəyə bilmirdi. Odur ki, Xalq Maarif Nazirliyi Qori Müəllimlər Seminariyasının Azərbaycan şöbəsinin müstəqil seminariya kimi Qazaxa köçürülməsi haqqında qərar qəbul etdi.

Müəllim seminariyasından başqa, xalq maarif sistemi üçün kadrlar hazırlayan müəssisələrdən biri də ali ibtidai məktəblər olmalı idi. Bu məqsədlə respublikanın Xalq Maarif Nazirliyi 1918-ci ildə bir sıra əməli işlər görmüşdü: Göyçayda məktəb açılmış, Ağdamda, Nuxa (Şəki) qəzasının Qutqaşen kəndində belə məktəblərin açılması haqqında qərar qəbul edilmişdir. 1918-ci ildə Zaqafqaziya dairəsində 25 ibtidai məktəbin açılması üçün nazirlik 199 min manat pul ayrılmışdı.

Azərbaycanda daxili vəziyyət gərgin olaraq qalırdı. Ermənistanın Azərbaycana qarşı davam edən müdaxiləsi zamanı minlərlə insan öz doğma yerlərini tərk edib, əsasən, Bakı quberniyasına gəlmişdi. Bu qaçqınların arasında müəllimlər və onların ailə üzvləri də var idi. Xalq Maarif Nazirliyi qaçqın müəllim ailələrinə kömək məqsədilə 20 min manat pul ayrılmış, onları mənzillə və ixtisaslarına uyğun işlə təmin etmək üçün bir sıra tədbirlər görmüşdü.

Bakı və digər yerlərdə dərs kitablarına, məktəb ləvazimatına olan böyük ehtiyacı nəzərə alaraq, Xalq Maarif Nazirliyi məktəblərin bu vasitələrlə təchiz edilməsi öz himayəsinə almışdı.

Cümhuriyyət Hökuməti məktəb dərsliklərinin hazırlanması və nəşrinə də ciddi diqqət yetirirdi. Bunun üçün Xalq Maarif Nazirliyinin xüsusi komissiyası təşkil edilmişdi. 1919-cu ildə "Türk əlifbası", "Təzə elmi-hesab", "İkinci il", "Yeni məktəb", "Ədəbiyyat dərsləri", "Müntəxəbat", "Türk çələngi", "Tarixi-təbii", "Rəhbər cəbr" dərslikləri nəşr olundu. Dərsliklərin hazırlanmasında Azərbaycan maarif və ədəbiyyatının görkəmli nümayəndələri Hüseyn Cavid, Mahmud bəy Mahmudbəyov, Abdulla Şaiq, Camo bəy Cəbrayılbəyli, Səməd ağa Ağamalıoğlu, Fərhad Ağazadə, Ağa bəy İsrafilbəyov, Abdulla bəy Əfəndizadə və başqaları fəal iştirak edirdilər. Məktəblər Türkiyədən alınmış dərsliklər və tədris vəsaitləri ilə də təmin olundu. Azərbaycan Parlamenti 18 sentyabr 1919-cu il tarixli qərarı ilə türk dilində yeni kitablar almaq üçün Xalq Maarifi Nazirliyinin sərəncamına 1 milyon manat vəsait ayırdı.

Azərbaycan Xalq Cümhuriyyətinin rəsmi orqanı olan "Azərbaycan" qəzeti Azərbaycan və rus dillərində nəşr olunurdu. Nəşriyyatlar, dəftərxana ləvazimatı satan mağazalar, həmçinin Məlikov qardaşlarının teatrı (indiki M.F.Axundzadə adına Opera və Balet Teatrı) Xalq Maarif Nazirliyinin tabelliyində idi. Bu müəssisələrdə çalışan fəhlələrin əmək haqları artırılmış, mənzil və əmək şəraitinin yaxşılaşdırılması üçün tədbirlər görülmüşdü. 1919-cu ilin əvvəllərində Azərbaycanda hökumətin ixtiyarında 23 orta məktəb var idi. Bakı, Gəncə və Qazaxda müəllim seminariyaları, Bakı, Gəncə və Şəkidə "Müqəddəs Nina" qadın məktəbləri, Bakıda politexnik və ticarət məktəbləri fəaliyyət göstərirdilər. Lənkəran qəzası 1919-cu ilin iyulunda Azərbaycan Xalq Cümhuriyyətinin hökumətə tabe edildikdən sonra, sentyabrda burada kişi və qadın gimnaziyaları fəaliyyətə başladılar.

1919-cu il sentyabrın 11-də Azərbaycan hökumətlərinin qərarı ilə "Müqəddəs Nina" qadın məktəblərinin adları dəyişdirilərək, Bakı Birinci Milli Qadın Gimnaziyası, Gəncə Qadın Gimnaziyası və Şəki Qadın Gimnaziyası adlandırıldı. 1919-cu ildə Xalq Maarif Nazirliyi Bakı, Şəki, Şuşa, Göyçayda realnı və müəllim hazırlayan məktəblər açılması haqqında parlamentə qanun layihəsi təqdim etdi və layihə bəyənildi.

1919-1920-ci tədris ilinin birinci yarısında müəllim seminariyaları istisna olmaqla, qalan məktəblərdə 9611 nəfər tələbə oxuyurdu ki, bunun da 3115 nəfəri azərbaycanlı idi. Hökumətin qərarı ilə Bakı Politexnik və Kommersiya məktəbləri, 3-cü, 4-cü Bakı məktəbləri və 2-3-4-cü Bakı qadın gimnaziyaları istisna olmaqla, Azərbaycanda fəaliyyət göstərən bütün orta məktəblərdə dərslər Azərbaycan dilində keçirilirdi.

Azərbaycan hökuməti ölkədə təhsil sistemini daha da genişləndirmək və dərinləşdirmək məqsədilə 1919-cu ilin yayında qısamüddətli pedaqoji kurslar açdı. Belə kurslar kişi və qadınlar üçün Bakı, Gəncə və Şəkidə, kişilər üçün Şuşa, Qazax, Qusar, Salyan və Zaqatalada açılmışdı. Hər kursda 50 nəfər təhsil alırdı və onlar təhsilini başa çatdırdıqdan sonra, dərhal müəllimlik fəaliyyətinə başlamalı idilər.

Azərbaycan Xalq Cümhuriyyətinin 1918-ci il iyunun 4-də Türkiyə ilə imzaladığı müqaviləyə arxalanaraq, Xalq Maarif Nazirliyi Türkiyədən 50 nəfər müəllim dəvət etmişdi. Onlar 1919-cu ilin oktyabr ayının əvvəllərində Azərbaycana gəlib müəllimlik fəaliyyətinə başladılar.

Maarif sahəsində həyata keçirilən mühüm islahatlardan biri də tədris müəssisələrinin lazımi ədəbiyyatla təchiz edilməsi idi. Bu sahədə 1919-1920-ci illərdə bir sıra işlər görülmüşdü. Xalq Maarif Nazirliyi Azərbaycan dilində dərsliklərin yazılması və nəşri üçün komissiya təşkil etmişdi. Türkiyədən də dərs vəsaiti və dərsliklər alınmışdı. Azərbaycan parlamentinin qərarına əsasən, 1919-cu il sentyabrın 1-də Bakıda Universitetlər təşkil edilməsi haqqında 10 maddəli qanun verildi.

Azərbaycan Xalq Cümhuriyyəti qarşısında duran ən ümdə vəzifələrdən biri də Azərbaycanda ali təhsilin təşkili və ali təhsilli milli kadrların hazırlanması idi. Hökumət bu məsələni, bir tərəfdən, ölkədə ali təhsil müəssisələri yaratmaq, digər tərəfdən, azərbaycanlı gəncləri xarici ölkələrin müxtəlif ali təhsil müəssisələrinə göndərməklə həll etməyə çalışırdı.

Azərbaycan Hökuməti Xalq Maarif Nazirliyi qarşısında, ilk növbədə, üç ali məktəbin - Bakı Dövlət Universiteti, Kənd Təsərrüfatı İnstitutu və Dövlət Konservatoriyasının açılması məsələsini qoymuşdu. Bakıda Kənd Təsərrüfatı İnstitutu açmaq məsələsi Hökumətin 5 mart 1919-cu il tarixli iclasında bəyənilmiş və Xalq Maarif Nazirliyinə bu məsələ ilə əlaqədar qanun layihəsi hazırlayıb Parlamentə təqdim etmək tapşırılmışdı. Lakin o dövrdəki tarixi şərait yalnız bir ali məktəbin - Bakı Dövlət Universitetinin açılmasına imkan verdi.

Bakıda universitet açılmasına böyük dövləti əhəmiyyət verən Cümhuriyyət Hökuməti bu məsələni 8 aprel 1919-cu il tarixli iclasında müzakirə etdi. Qəbul olunan qərarda, bütün imkanlardan istifadə edərək, 1919-1920-ci tədris ilinin əvvəlində Bakıda universitet açılması məqsədilə Xalq Maarif Nazirliyinə tapşırıldı ki, ümumi həcmi 10 milyon manatdan çox olmamaq şərtilə, smeta hazırlayıb Hökumətə təqdim etsin. Hökumətin qərarına əsasən, Bakı Universiteti kommersiya məktəbinin binasında yerləşdirilməli idi. Həmin il mayın 19-da Azərbaycan Hökuməti yenidən Bakı Universitetini açmaq üçün təşkilat komissiyası yaratmaq və vəsait ayırmaq haqqında məsələ müzakirə etdi, universitet komissiyası haqqında əsasnaməni bəyəndi. Mayın 21-də komissiyanın birinci iclası keçirildi. Xalq Maarif naziri vəzifəsini icra edən Camo bəy Hacınski iclasda Azərbaycan Hökumətinin dövlət universiteti açmaq haqqında qəti qərara gəldiyini və təşkilat komissiyasının bu çətin işi uğurla yerinə yetirmək üçün bütün imkanlardan istifadə edəcəyinə ümidvar olduğunu bildirdi. O, bəyan etdi ki, Azərbaycan Hökuməti universitetin Azərbaycan xalqının həyatında çox böyük mədəni və siyasi əhəmiyyətini nəzərə alaraq, onun açılması və lazımi avadanlıqlarla təchizi üçün heç nəyi əsirgəməyəcəkdir.

Universiteti professor-müəllim heyəti ilə təmin etmək üçün tanınmış alimlər dəvət olundular. Avadanlıq, kitablar alınması üçün 1 milyon manat pul ayrıldı. Azərbaycan parlamentinin üzvləri, dövlət müəssisələrinin qulluqçuları universitet professorlarının ilk mühazirələrində iştirak etmişdilər.

Universitetin ilk rektoru tibb elmi sahəsində tanınmış alim, cərrah Vasili İvanoviç Razumovski (1875-1935) olmuşdu. Razumovskinin Azərbaycanda ali təhsil sisteminin yaradılması və inkişafında böyük xidmətləri olub. O, Bakı Universitetinin açılması ilə bağlı qeyd edirdi ki, universitet və maarifin dostları arasında əsas yeri parlamentin nüfuzlu üzvü Məhəmməd Əmin Rəsulzadə, parlamentin sədri doktor Əhməd bəy Ağayev və katib Əhməd Pepionov parlamentin sosialist qrupu, xüsusilə, Səmədağa Ağamaloğlu tuturdular. Universitetdə Məhəmməd Əmin Rəsulzadə Osmanlı ədəbiyyatı tarixini, Mirzə Rəhim Mirzəyev türk dilini, R.Kaplanov Osmanlı ədəbiyyatı tarixini tədris edirdilər.

Bakı Dövlət Universitetinin açılması ilə yanaşı, parlamentin qərarı ilə ali təhsil almaq üçün 100 nəfər azərbaycanlı gənc xarici ölkələrə - İngiltərə, İtaliya, Fransa və Türkiyəyə yola salınmışdı. Bir neçə tələbənin Rusiyanın təhsil müəssisələrinə göndərilməsi də qərara alınmışdı. Lakin xarici hərbi müdaxilə və vətəndaş müharibəsi getdiyinə görə, bu tədbir baş tutmamışdı. Xarici ölkələrə gedən gənclər ali təhsil alıb Vətənə qayıtdıqdan sonra 4 il müddətində Azərbaycan hökumətinin təyinatı ilə işləməli idilər.

O dövrdə savadsızlığın ləğv edilməsi sahəsində mühüm addımlar atılmışdı. 1919-cu ildə Bakı, Şuşa, Şəki, Zaqatala və Qazaxda yaşlı əhali üçün Azərbaycan dili üzrə axşam kursları açılmışdı. Bu kurslarda təhsil müddəti, iki hissəyə bölünməklə, 1920-ci il aprelin 1-nə qədər davam etmişdi.

Bundan əlavə, Bakıda parlamentin üzvü Abdulla bəy Əfəndiyevin rəhbərliyi ilə ibtidai məktəb müəllimləri üçün xüsusi kurslar açılmışdı. Bu kurslarda pedaqogika, Azərbaycan dilinin tədrisi metodikası öyrənilirdi.

Azərbaycan Xalq Cümhuriyyətinin mədəni-maarif sahəsindəki siyasətində milli mənafelərə hörmət prinsipi çox yüksək tutulur və demokratik xarakter daşıyırdı. Bu siyasət Azərbaycanda yaşayan bütün millətlərin mənafeyinə uyğun idi, onların mədəni inkişafı üçün geniş və real imkanlar yaratmışdı.

**Elman Mirzəyev,**
**Azərbaycan tarixi kafedrasının baş müəllimi, tarix üzrə fəlsəfə doktoru**

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Əməkdar elm xadimi, professor

**Süleyman Məmmədovun**

vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Biologiya və onun tədrisi metodikası kafedrasının dosenti Əliyannağı Məhərrəmova, atası

**Məmmədtağı Məhərrəmovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi fizika kafedrasının dosenti

**İltifat Dadaşovun**

vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

**Redaktor əvəzi:** Mahirə MUSTAFAYEVA

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 2006
Sayı: 1500
Çapa imzalanıb: 29.06.2018-ci il

ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsində yığılıb, "Azərbaycan" Nəşriyyatında səhifələnib və ofset üsulu ilə çap edilib.